Yeri gəlmişkən, qeyd edək ki, tərcüməşunaslar arasında ekvivalentlik və adekvatlıq anlayışına münasibətlər fərqlidir. Barxudarov, Komissarov və digərləri ekvivalentlik və adekvatlıq terminlərini sinonim kimi qəbul etdikləri halda, A.D.Şveyser, A.Popoviç ekvivalentliyi məzmun etirabı ilə orijinala daha yaxın tərcümə variantı kimi qəbul edirlər və edirlər ki, istənilən adekvat tərcümə orijinalın forma və məzmununu qismən əks etdirə bilər.

Tərcüməçinin orijinal mətnin praqmatik məzmununa "düzəliş", dəyişiklik etməsi qaçılmazdır, çünki söhbət fərqli dillərdən, fərqli mədəniyyətlərdən gedir. Yəni tərcümə dilinin daşıyıcıları ilə orijinalın dilində danışanlar arasında eyni praqmatik prezumpsiya mövcud deyildir: "..... kəndlilərin əlində bir şey gördüm: uzaqdan çubuq sapına oxşatdım, amma akoşkadan yavıq gəldim və diqqətlə baxıb gördüm ki, kəndlilərin əlindəki yan tütəyidir" (C.Məmmədquluzadə)

İndi tərcüməyə nəzər salaq: "…. Крестьяне держали в рукахкакие-то предметы, напоминавшие длинные чубучные мундштуки; подойдя к окну, я увидел, что они держали свирели, то есть дудки, на которых обычно играют пастухи" (Tərcümə Ə.Şərifindir)

Göründüyü kimi, eyni praqmatik prezumpsiyanın olmaması izahat xarakterli tərcümə əlavələri tələb etmişdir.

Beləliklə, yuxarıda göstərilən nümunələr bir daha sübüt edir ki, orijinalın praqmatik potensialının tərcümə oxucularına yönləndirilməsi, ünvanlanması əksər hallarda mətnində tramsformasiyalar edilməsini, onun məzmun mənasının modifikasiyasını tələb edir. Lakin bu transformasiyalar yalnız müvafiq leksik-qrammatik kontekstlər vasitəsi ilə reallaşa bilər. Başqa sözlə desək, tərcümə prosesinin bu iki mühüm faktorunu bir-birindən təcrid təsəvvür etmək mümkün deyildir.

**Ədəbiyyat:**


1. Комиссаров В.Н. «Теория перевода» М., Высшая школа. 1990. (153 с.)
2. Жорж Мунен. «Переводчик. Слово и понятие.»// «Перевод-средство взаимосближения народов.» М., Прогресс 1987. (640 с.)
3. Шмелев Д.М. «Современный русский язык. Лексика.» М., Просвещение 1977 (335 с.)
4. Бархударов А.С. «Язык и перевод» М., Издательство «Международные отношения» 1975 (240 с.)
5. Швейцер А.Д. «Теория перевода. Статус, проблемы, аспекты.» М., Наука 1988 (215 с.)
6. Тетради переводчика. М., Издательство «Международные отношения» 1968 (126 с.)
7. Кожина М.Н. «Стилистика русского языка» М. Просвещение. 1977 (223 с.)


**Translation transformations and the correlation of context**

**Summary**


The article is devoted to the usage of lexical and grammatical transformation, that forms referential and pragmatic content of originality.On the examples of different materials is analyzed the interconnection of translation transformations and lexico-grammatical contexts.Pragmatical potential of originality in the second language is frequently considered on the work .


**Взаимосвязь переводческих трансформаций и контеста**

**Резюме**


В статье речь идет о предпосылках применения лексических и грамматических трансформаций, которые призваны воссоздать в переводе референциальное и прагматическое содержание оригинала. На примере различных материалов анализируется взаимосвязь переводческих трансформаций и лексико-грам матических контекстов. В работе подробно останавливается над вопросом сохранения прагматического потенциала оригинала на втором языке.

**D.Ağayeva**
Azərbaycan Dillər Universiteti
durniseagayeva@gmail.com

**İSPAN DİLÇİLİYİNDƏ PAREMİOLOGİYANIN TƏDQİQİNƏ DAİR**

***Açar sözlər:*** *folklor, atalar sözləri, məsəllər, tədqiqat tarixi, fəlsəfə*
***Key words:*** *folk-lore, proverb, saying, research history, philosophy*
***Ключевые слова:*** *фольклор, пословица, поговорка, история исследований философия*

Əgər hər hansı xalqın ünsiyyət vasitəsi kimi istifadə etdiyi dil canlidirsa, yaşayırsa onun lüğət tərkibi, fonetik sistemi, qrammatikası daimi inkişafdadır, dialektik qanunauyğunluqla bir keyfiyyətdən başqa bir keyfiyyətə keçir. Dildə həmişə bir çox hadisələr, dəyişmələr baş verir: bəzən sözlər, qrammatik normalar köhnəlir, uzaq keçmişdə qalır, yeniləri törəyir, əmələ gəlir və geniş işləklik imkanı əldə edir. Bu mənzərəni də dəqiq müşahidə etmək cəhətdən folklorun müxtəlif janrlarının öyrənilməsi zəruriyyəti meydana çıxır.

Atalar sözləri dedikdə ilk növbədə xalq tərəfindən yaradılmış, qədim yazılı mənbələrdən və bədii ədəbiyyatdan götürülmüş müdrik fikirləri qısa formada çatdıran tutarlı ifadələr nəzərdə tutulur. Bir qayda olaraq atalar sözləri həqiqi və məcazi məna daşıyır. Adətən eyni mənəvi dəyəri ifadə edən müxtəlif cür atalar sözləri olur. Bu kəlamlarda xalqın bütün idrak təcrübəsi, onun mənəvi – etik, sosial – estetik, bədii və əxlaqi ideyaları möhürlənib. Onlar xalqın sivilizasiya boyu inkişaf tarixini özündə qoruyub saxlayır, hər bir xalqın təbiətini, onun qonşu xalqlarla münasibətini əks etdirir. Dilin tarixi inkişaf nəticəsində yaranaraq mənaca da bölünməz olan atalar sözləri bu dilin əski adət ənənələrə güzgü tutan mürəkkəb frazeoloji sistemiylə bütövləşmişdir. Ona görə də atalar sözündə bir sözü yerindən oynatmaq, ya sözlərin sırasını dəyişdirmək o ifadənin sintaksisini pozub təsir gücünü azalda bilir. (1: səh4)

Məlum olduğu kimi folklor xalq yaradıcılığıdır və bugünkü gün xalq psixologiyasını tədqiq etmək üçün çox vacib əhəmiyyət daşıyır. Folklor özündə xalqın əsas həyat dəyərlərini - əməyi, ailəni, sevgini, ictimai məsuliyyəti, vətənə sevgini əks etdirən fikirləri cəmləşdirir. Məhz bu fikirlər əsasında da bizim övladlar tərbiyə alır və böyüyürlər. Folkloru bilməklə biz həmin xalq haqqında geniş məlumat ala bilirik. Dil ilə folklorun sərhədində dayanan və xalqın milli təfəkkür səviyyəsini anlamaq baxımından heyrətamiz dərəcədə böyük dəyəri olan bu tərkiblərdə alınma sözlər demək olar ki yox dərəcəsindədir.

Azərbaycanda atalar sözü və zərb məsəllərin toplanması və nəşri əsasən Hənəfi Zeynallı və Əbülqasım Hüseynzadənin adı ilə bağlıdır; lakin onların hər ikisinin yaradıcılıq yolu bir – birindən fərqlənir. Hənəfii Zeynallının 1926 – cı ildə "Azərbaycanı tədqiq və tətəbbö cəmiyyəti" kitabı ilk tədqiqat səciyyəli əsər hesab olunmaqla bərabər, atalar sözlərinin kəmiyyətcə çoxluğu ilə də özünə qədər çapdan çıxmış və həmən mövzuya həsr edilmiş əsərlərdən fərqlənir. Ə. Hüseynzadə isə el ədəbiyyatını toplamaq işinə hələ 1909 – cu ildən, məktəbdə oxuyarkən həvəs göstərmişdir. O, 1926 – cı ildən etibarən müxtəlif adlarda atalar sözlərini gah əlifba sırası ilə, gah da mövzu oxşarlığına görə bölmüş, kitabları tərtib etmiş və nəşr etdirmişdir.

Atalar sözlərini yuxarıda adları çəkilən folklorşünaslardan başqa "Rəvayətli ifadələr" başlığı ilə Böyükağa Hüseynov da toplamış və çap etdirmişdir. Bu kitabın əvvəlkilərdən fərqli cəhətlərindən başlıcası odur ki, orada toplanan ifadələrin yığcam qəlib şəklinə düşənə qədər keçdiyi yolun tarixçəsi şərh edilir, elmi nəzəri əsasda maraqlı müqəddiməsi var.(2: səh 17)

Hikmətli kəlamlar sözsüz ki, çox qədim zamanlardan mövcuddurlar və yazı icad olunandan bəri onlar da yazıya köçürülüb toplanmışdırlar. ***Süleyman Peyğəmbərin kəlamları*** Homerin "İliada" poemasından 200 il əvvəl daha doğrusu eramızdan əvvəl X əsrdə yazıya alınmışdır. Bu kəlamlarda da Misir fironu ***Amenemopetinmudriklikkitabının***və bəzən də Assuriyalı Ahikanın müdriklik doktrinasının təsiri hiss olunur. Yunanlar da həmçinin bu sahədə qədim mədəniyyətdən bəhrələnmişdirlər. Onların nağıllarının, təsniflərinin,əfsanələrinin kökü Qədim Mesopotamiya və Misir mədəniyyətinə bağlıdır. Lakin, paremiyaların elmi araşdırması Aristotel ilə başlayır. Yunan yazarı Leartlı Diogen özünün "Paremiya" adlı kitabı ilə Aristotelin isləmələrinə bir qədər əlavələr edib. Çox təəssüf ki, bu kitab itmişdir. Lakin Aristotelin paremiyalara olan marağı bir neçə tarixi əsərlərdə öz əksini tapmışdır. Paremiyalar antik fəlsəfənin yadigarı hesab olunurlar.

Romalılar arasında atalar sözləri və məsəllərin tədqiqinə maraq daha az olub. Qədim dövr mütəfəkkirləri və qramatika mütəxəsisləri atalar sözləri və məsəlləri yalnız çətin anlaşılan ifadələri izah edərkən tədqiq edirdilər. Lakin bu o demek deyil ki, romalılar atalar sözlərindən istifadə etmirdilər. Plavtın və Terensiusun komediyalarında, Siseronun əsərlərində, Vergili, Horasi və Ovidi kimi şair, filosof və tarixçilərin əsərlərində onlara rast gəlmək olar.

Universal olaraq qəbul edilən atalar sözlərinin ümumbəşəri faydalılığı onları şəhərdən şəhərə aparan bir vasitə idi və onların hər birinə hər bir xalqın mədəniyyətinin və adətlərinin təbiətinə uyğun olaraq xüsusi bir çalar qatırdı.

Atalar sözləri üçün ümubəşəri dəyərlər də səciyyəvidir. Bu səbəbdəndir ki, bəlli bir xalqa məxsus hansısa atalar sözünün bu və ya digər qarşılığını istənilən başqa xalqda tapmaq mümkündür. Atalar sözü və məsəllər uzun illərdən bəri müzakirə və tədqiqat predmetidirlər. İspaniyada isə bu sahənin tədqiqinə XV əsrin axırlarından maraq artmışdır. (3: səh 6)

Paremiologiya -(qədim yunan dilində παροιμία paroimia — ibrətli hekayə, atalar sözü və λόγος logos — söz, öyrənmə) filologiya elminin xalqların həyat təcrübələrinə, baxışlarına, mənəvi dəyərlərinə əsaslanan qısa, verbal və

obrazlı ifadələr olan atalar sözləri, məsəllər, deyimlər, şüarlar, devizlər, aforizmlər və başqa bu kimi ifadələrin öyrənilməsi və təsnif edilməsi ilə məşğul olan bir hissəsidir.

XVI əsrin ikinci yarısında paremiologiya sahəsində məşhur ispan tədqiqatçısı X.M. İrrivarenin yazdığına görə Xuan de Timoneda özünün "Sobremesa y alivio de caminantes" adlı əsərində yüzdən artıq atalar sözünün işlənməsini analiz edib və mənşəyini izah edib. 1568 – ci ildə Sevilyalı şair Xuan de Mal Lara "Philosophia vulgar" (Sadə xalq fəlsəfəsi) əsərində ən çox işlənən atalar sözlərini toplayıb və onların izahını verib. Əsərin müqəddiməsində müəllif yazır: "Atalar sözləri və məsəllər bizim nitqimizi və yazımızı bəzəməyə xidmət edirlər. Onlar sanki bahalı paltarlardan qopan, öz işıqları ilə insanın gözünü qamaşdıran qiymətli daş – qaşlar kimidirlər, qeyd etmək lazımdır ki, onlar dinləyicilərə dərin məmnunluq hissi yaşadır və yaddaşlarda əbədi olaraq həkk olunur.

İspan mütəfəkkiri, ispan ədəbiyyatı və tarixinin tədqiqatçısı, professor Xose Amador de los Riyos özünün "İspan ədəbiyyatının tarixi təsviri" əsərinin "İncəsənətin bir hissəsi olan atalar sözləri haqqında" adlı II hissəsində atalar sözlərini bu cür qiymətləndirir: "Atalar sözləri hər hansı bir xalqın düşüncə tərzini, ibtidai və fəlsəfi təfəkkürünü əks etdirən vasitə rolunu oynayır və onların aşağıdakı xüsusiyyətləri var:

- nəsihət və təsəlli xarakteri daşıdıqda dinə
- xəbərdarlıq etmək, hər hansı təhlükənin qarşısını almaq istədikdə siyasətə
- öyüd, nəsihət verərkən mənəviyyata
- bir şəxsi duymaq və ona mənəvi qiymət vermək istədikdə idraka, düşüncəyə
- hər hansı tədbir görmək, məsləhət vermək istədikdə təmizliyə
- məşvərət etdikdə idarətməyə
- müqayisə etmək, fərqləndirmək istədikdə, hər hansı məsələni qəbul etdikdə iqtisadiyyata aid olur" (4: səh 511)

Daha sonra müəllif əlavə edir "Mədh edən, hikmətli, ibrətli, nəsihətverici, inandırıcı, təsviri atalar sözləri həyatın istənilən hallarında qaydalar təsis etmək üçün yaranmışdırlar." Bir qədər irəlidə müəllif çox gözəl bir müqayisə edir "Xalqlar körpə uşaq kimidirlər – öz beşikləri ətrafında bir laylaya ehtiyac duyarlar; böyüdükdə isə öz həyatarını yaşadıqları ömrün bəhrəsi olan bu sadə və faydalı nəsihətlərlə nizama salarlar." (4:səh 531)

Növbəti əsrdə Fransisko de Kevedo "Cuento de cuentos" və "Premáticas y aranceles" əsərində öz dövrünün ən məşhur atalar sözlərini və məsəllərini toplamışdır. Müasir dövrdə atalar sözləri və məsəllər Klemensin, Peyiser, Seyxas Patinyo, Fernán Kabayero, Qarsiya Blanko, Bastús, Sexador, Montoto, Sbarbi, Rodrigez Martin, Visente Veqa kimi məşhur folklorşunasların tədqiqat obyektidirlər.

XX əsrdə frazeologizmlərin həmçinin atalar sözləri və məsəllərin lüğət və topuları tərtib edildikcə bu növ hikmətli kəlamların tədqiqatına maraq artmışdır. İspan atalar sözlərinin, məsəllərinin, kəlamlarının, ibarələrinin nisbətən daha tam toplusu X.M.Sbarbinin "İspan dilinin böyük atalar sözü lüğəti" buraxılışı hesab edilir.

İspan dilçiliyində yuxarıda adını qeyd etdiyimiz lüğətdən başqa atalar sözləri və məsəllər haqqında bir sıra digər böyük həcmli lüğətlər və toplular da nəşr olunmuşdur. Lakin buna baxmayaraq bu sahədə nəzəri tədqiqat işlərinin sayı azdır.İspan atalar sözləri və məsəlləri haqqında daha ciddi tədqiqat işi kimi X.M Sbarbinin "İspan dilinin atalar sözləri, məsəlləri və qanadlı ifadələri haqqında monoqrafiya" adlı əsərinin (J.M.Sbarbi, 1980) və X. Seviya Munyoz, X.Kantera Ortiz de Urbinanın "Bir neçə söz kifayətdir: həyat və atalar sözlərinin mədəniyyətlərarası əhəmiyyəti" adlı (J.Sevilla Muñoz, J.Cantera Ortiz de Urbina, 2002) kitabının adını çəkmək olar.

Adları çəkilən tədqiqat işlərinin əsas məqsədi ayrı – ayrı ifadələrinn etimoloji tədqiqatı, bu və ya digər frazeoloji birləşmələrin yeni izahlarının araşdırılmasıdır.

1993-cü ildə İspaniyada həm İspan həm də digər xalqların atalar sözlərinin tədqiqinə həsr olunmuş jurnal təsis edilmişdir. Dilçilər bu jurnal vasitəsilə paremiologiya elminin inkişafına böyük ümidlər bəsləyirlər.

İspan filoloqu, paremioloqu, tərcüməçi, Madrid Komplutense Universitetinin professoru, "Paremiya" jurnalının təsisçisi Xulia Seviya Munyoz İspan paremialogiyasında böyük işlər görmüşdür. Onun bu sahə üzrə çox maraqlı tədqiqat işləri, nəzəriyyələri mövcuddur. Komplutense Universitetinin Fransız dili kafedrasının müdiri professor Xesus Kanteranın rəhbərliyi ilə "Fransız və ispan dillərində heyvan adları olan atalar sözləri,deyimlər və digər ifadələr " adlı çox böyük – 3141 səhifəlik doktorluq dissertasiyasını müdafiə edib doktorluq dərəcəsini almışdır. Tədqiqatın üçüncü fəslində müəllif qeyd edir: "Zəngin və qədim tarixi olan ispan və fransız atalar sözləri bir çox toplu və məcmuə halında yığılmışdır, lakin hər iki dilin paremiaları konseptual aspektdə tədqiq olunduğuna görə nəzəri cəhətdən yetərli olmamışdır və hər iki dildə çox böyük leksik xaos yaşanmaqdadır. Bu qarışıqlıq bu sahədə işlənən terminlərdə özünü açıq biruzə verir. Bir çox müəlliflər paremiloji vahidlərin adlarının özəlliklərinin və spesifik xüsusiyyətlərinin fərqinə varmadan onları sinonim kimi verməklə bu qarışıqlığı daha da dərinləşdirirlər."

Xuliya Seviyaya görə bu leksik və terminoloji dəqiqliyin olmaması ispan və fransız paremiolojii vahidlərin müqayisəli tədqiqatını apardıqda böyük çətinlik yaradır. Hikmətli kəlamların hər hansı bir növünü adlandıran, təyin edən terminlərin çoxluğu problemi daha da dərinləşdirir. Müəllifin öz tədqiqat işində tərtib etdiyi siyahıda bu terminlərin sayı yüzə çatır. Müəllif bu qarışıqlığı nizama salmaq üçün fransız və ispan paremiyalarını üç qrupa bölərək aşağıdakı təsnifatı aparıb.

- Tam paremioloji vahidlər
- Yarım paremioloji vahidlər
- Qeyri paremioloji vahidlər.

Sonda qısa bir epiloqda Xuliya Seviya etiraf edir ki, son zamanlar atalar sözləri daha az işlənir. Və düşünür ki, buna səbəb odur ki, onlar keçmiş zamanı, keçmiş dünyanı əks etdirirlər. Atalar sözləri olan kitablar yaşadığımız texnologiya dövrünə cavab vermirlər. Çünki ulağı surməklə traktoru sürmək bir deyil.

Luiz Martinez Kleyserin "Refranero general İdeológico Español" əsərinə müqəddimə yazan dramaturq, jurnalist Xoakin Kalvo – Sotelo isə yazır:"İspaniya kənd təsərüffatının sənaye üzərində hökm sürdüyü bir ölkə olub. Bu iki istehsal sahəsi son beş ildə əhəmiyyətli dərəcədə yerlərini dəyişiblər. Bu da özünü adambaşına düşən gəlirin artmasında açıq aydın biruzə verir. Lakin kənd həyatının məhsuldarlığının azalması atalar sözlərində də özünü göstərir, cünki atalar sözlərinin yaranması üçün münbit şərait torpaq olub, fabriklər yox. Əgər onların köklərinə baş vursaq görərik ki, bu hikmətli kəlamlar meteorologiyaya, təqvimə, təbiət qüvvələrinə, heyvanat aləminə aid olublar, nəticə olaraq demək olar ki, kənd həyatının mayasıdırlar atalar sözləri" (5:səh5-6)

Bütün deyilənlərdə çox böyük və dərin həqiqət vardır. Çünki, yeni texnoloji kəsflər, yeni texnologiyalar çox təəssüf ki, özləri ilə atalar sözləri gətirmirlər.

**Ədəbiyyat:**


1. Cəlal Bəydili (Məmmədov) "Atalar Sözü" Öndər Nəşriyyat. Bakı – 2004
2. Ziynət Əlizadə "Azərbaycan atalar sözlərinin həyatı" Bakı. Yazıçı. 1985
3. Курчаткина Н.Н., Супрун А.В. Фразеология испанского языка: Учеб.пособие для ин-тов и фак. иностр. яз. - М . : Высш. школа, 1981.
4. José Amador de los Rios. "Historia crítica de la literatura" II tomo 1861
5. Martinez Kleiser Luis "Refranero general İdeológico Español" Real Academia Española Madrid 1989


**About the study of paremiology in Spanish linguistic**

**Summary**

The aim of this research is to provide information on the history of the study of proverbs, both in Azerbaijani and in Spanish, and to determine the place of proverbs in linguistics. As a result of the research, it becomes clear that proverbs are one of the most valuable pearls. To gather all these expressions together is a very difficult, but at the same time interesting work. Being one of the branches of folklore language, by means of investigation of proverbs it is possible to study the subtleties of a given language, history, life of a given people, etc. From the article it becomes clear that common values are characteristic of proverbs. For this reason, it is possible to find the equivalent of a proverb belonging to a certain people from another nation. However,at the moment, both in Azerbaijani and Spanish linguistics, the process of the emergence of new proverbs has stopped. Scientists see the reason for this in the use of new technical means in agriculture.Because the emergence of many proverbs is associated with the land, village life and manual labor.

**Об изучении паремиологии в испанской лингвистике**

**Резюме**

Целью данного исследования является предоставление информации об истории исследования пословиц, как в азербайджанском, так и в испанском языках и определить место пословиц в языкознание. В результате проведенного исследования становится ясно, что пословицы являются одной из самых дорогих жемчужин. Собрать воедино все эти выражения является очень сложной, но в то же самое время интересной работой. Являясь областью фольклорного языка, при исследовании которого возможно изучить тонкости данного языка, историю, быт данного народа и т. д. из статьи становится ясно, что для пословиц характерны общепринятые ценности. По этой причине, возможно, найти эквивалент какой либо пословицы принадлежащей определенному народу у другого народа. Но на данный момент, как в азербайджанском, так и испанском языкознаниях процесс возникновения новых пословиц остановился. Ученые видят причину этого в использование новых технических средств в сельском хозяйстве. Поскольку возникновение многих пословиц связано с землёй, деревенской жизнью и ручным трудом.

**С.Г. Азизова**
Азербайджанский университет языков

# СИМВОЛИЧЕСКАЯ ОСОБЕННОСТЬ ЦВЕТА В ФРАЗЕОЛОГИЗМАХ ИСПАНСКОГО ЯЗЫКА

***Ключевые слова:*** *фразеология, цвет, фразеологические единицы, язык, культура, значение, перевод, словосочетание, испанский, арабский.*
***Açar sözlər:*** *frazeologiya, rəng, frazeoloji vahidlər, dil,mədəniyyət, məna, tərcümə, söz birləşməsi, ispan, ərəb.*
***Keywords:*** *phraseology, colour, idioms, language, culture, meaning, translation, collocation, Spanish, Arabian.*

Цвет является одним из свойств объектов материального мира и воспринимается как осознанное зрительное ощущение благодаря человеческому мышлению. Воздействие цвета на сознание человека и его ощущения было замечено давно. Люди с незапамятных времен придавали особое значение чтению «языка красок», что нашло отражение в древних мифах, народных преданиях, сказках, различных религиозных и мистических учениях, на социальное положение людей, их различные психологические состояния. Это проявлялось в подборе одежды определенных цветов, народных поговорках и пословицах. [3;15]

Цвет «окрашивает» все сферы жизни народа: бытовую, эмоциональную, культурную, общественно-политическую, вследствие чего источниками исконно испанских фразеологизмов с компонентом цвета являются самые различные области жизни народа. Это могут быть обычаи, традиции, суеверия, а также ассоциации с тем или иным цветом. «Сердцем» любого языка является его фразеология. Для более глубокого анализа и изучения того или иного языка необходимо внедриться в его фразеологию, так как именно она содержит в себе всю историю становления и развития народа и языка. Учитывая растущий интерес к испанскому языку, а также развитие международных отношений, данная статья посвящается особенностям употребления цветообозначений в фразеологических единицах испанского языка.[1;23]. Цвет воздействует на психику человека, поэтому в языках и культурах многих народов определенные цвета имеют символическое значение. И это в свою очередь способствовало тому, что цветовое восприятие мира нашло свое отражение в лексической и фразеологической системах языка. Устойчивые словосочетания, в состав которых входят цвета, участвуют в межкультурной коммуникации, указывая на своеобразие того или иного языка.

Как выявлено, в испанской цветофразеологии чаще всего используются черный (negro), белый (blanco) и красный (rojo) цвета.Менее частотны зеленый (verde), синий (azul), желтый (amarillo) и золотой (oro).[3;50]

В испанском языке цвето-наименования со значением 'белый', как и в других языках, сформировались на основе цвета снега, бумаги и молока. На этих ассоциациях основаны такие устойчивые сравнения, как 'blanco como la nieve' - 'белый как снег', 'blanco como el papel - 'белый как бумага'. Довольно часто история, быт, культура и дух народа отражаются в испанских фразеологических единицах с прилагательным 'белый'. Известно, что в Древнем Риме представители верхушки общества носили тоги и туники белого цвета, женщины «из общества» - белые платья (столы) [5;46]. Возникновение выражения 'pasar la noche en blanco' (букв. 'провести ночь в белом') - 'не смыкая глаз' связано с ритуалом некоторых рыцарских орденов, в которых требовалось, чтобы кандидат «в белом» провел ночь в церкви или часовне. «В белом» - потому, что будущие рыцари были одеты в белые туники, символ духовной чистоты. Довольно интересен другой фразеологизм «estar sin blanca», который дословно переводится 'быть без белой', т. е. 'быть без гроша', 'сидеть на мели', возможно, связано с тем, что 'la blanca' (белая) - монета из серебра и меди, которая называлась «Blanca del Agnus Dei», была отчеканена в 1386 году во времена царствования Хуана I Кастильского. С течением времени монета была обесценена и чеканелась только из меди, став незначительной по цене. Белый - это цвет богов, святых. В эпоху цивилизации «белый» всюду символизировал главное, верховное божество. Раньше в Таиланде священные слоны были символом королевской власти. Чем больше слонов имел король, тем больше был его статус. Королям часто дарили белых слонов, погашая долги. Это был дорогостоящий подарок, но вскоре выяснилось, что траты на их пропитание были очень высокими. Отсюда и возникло выражение 'un elefante blanco' (букв. 'белый слон') - 'дорогая безделушка', 'дорогостоящая бесполезная вещь'. [5;547]

Номинативное значение прилагательного, обозначающего черный цвет, в испанском языке основывается на естественном цвете угля, сажи, смолы. На основе этих ассоциаций строятся, например, такие устойчивые словосочетания и выражения, как 'negro como el carbon' - 'черный, как уголь', 'las cosas se están poniendo negras' (букв. 'вещи становятся черными') - 'дела - как сажа бела'. Черный цвет в испанской, как и во многих культурах, воспринимается как символ несчастья и невезения ('suerte negra' (букв. 'черная судьба') - 'горькая доля'), тяжелого времени ('día negro(букв. 'черный день') - 'неудачный, роковой день'). Испанский язык унаследовал из латыни переносное значение прилагательного 'niger': 'хмурый, подавленный, мрачный'. Эти значения отражены в устойчивых словосочетаниях: 'estar de un humor negro' (букв. 'находиться в черном настроении') - 'быть мрачным, подавленным', 'más negro que la muerte'[6] (букв. 'чернее, чем смерть') - 'беспросветный, мрачный, хуже некуда (о ситуации)' [6;320]. Некоторые фразеологические единицы демонстрируют еще одно значение слова 'чер- ный' - 'незаконный': 'mercado negro' (букв. 'черный рынок') - 'незаконная торговля', 'dinero negro' (букв. 'черные деньги').

Переходя к характеристике красного цвета, заметим, что он представлен менее популярным. Однако необходимо отметить достаточно важную роль красного цвета в жизни людей на ранних ступенях развития человечества. Красный цвет у испанского народа символизировал «кровь или адское пламя»: 'rojo como sangre' - красный, как кровь. Красный цвет сигнализирует об опасности и вызывает наиболее сильную физиологическую реакцию, т. е. учащение сердцебиения и тревогу. Такое значение наблюдается во фразеологизме 'ponerse rojo' (букв. 'становиться красным') - 'покраснеть от смущения', 'poner rojo a uno' (букв. 'сделать красным кого- либо') - 'вогнать кого-либо в краску', 'rojo como un cangrejo' - 'красный, как рак'[5;176].

В испанском языке значение прилагательного 'зеленый' основывается на естественном цвете травы и изумруда. 'Зеленый' включает в своей референции значение растительности - свежий, молодой, неувядающий', подтверждение чему можно обнаружить в следующих примерах [7;231]: 'estar verde' (букв. 'быть зеленым') - 'быть незрелым, не готовым для чего- либо, быть неспелым', 'años verdes' (букв. 'зеленые годы') - 'молодые годы.

Как и во всех культурах, в испанской культуре функционирует выражение 'prensa amarilla" - 'желтая, скандальная пресса'.[9;98]

В испанском языке основным обозначением синего цвета является прилагательное 'azul - 'синий'. Оно произошло от арабского существительного 'lazaward" - 'ляпис-лазурь (лазурит) - камень синего цвета, используемый в процессе окрашивания тканей'. В испанском языке выражения 'sangre azul - 'голубая кровь' и 'príncipe azul - «принц голубых кровей» появились в среде испанской аристократии Кастилии[9]. Аристократы гордились тем, что их предки никогда не вступали в браки с маврами, и об этом свидетельствует их светлая кожа с голубоватыми венами. Мавры обладали темным цветом кожи, потому что жили и работали на улице.

Будучи компонентом фразеологической единицы, предмет цвета играет важную роль в системе языка и культуры, способствуя выявлению национально-культурных особенностей испанского народа. В результате проведенного анализа было выявлено, что корни испанских фразеологизмов, имеющих в своем составе цветонаименования, кроются в этническом прошлом народа, в ассоциациях, которые цвет вызывал у людей, в символах, обозначаемых различными цветами. Можно говорить о цветовой символике фразеологизмов, об их глубокой и неслучайной связи с различными этапами человеческого сознания и общественно-культурной жизни.

**Литературы:**


1. Вакуров В.Н. Основы стилистики фразеологических единиц. М.: Изд-воМГУ, 1983.
2.Gran diccionario de refranes de la lengua española (JM Sbarbi 1943),
3.Миронова Л. Н. Цветоведение. Минск, 1984. 286
4.Виноградов В.С. Сопоставительная морфология русского и испанского языков / В.С. Виноградов, И.Г. Милославский. М: Русскийязык, 1986.
5.Buitrago, A. Diccionario de dichos y frases hechas. Madrid: Espasa-Calpe, S.A., 2007. p.
6.Vales, J. C. Dichos y Frases hechas / J. C. Vales, B. M. Belén. Madrid: Ed. Libsa, 2001.
7.Вежбицкая, А. Обозначения цвета и универсалии зрительного восприятия // Язык. Культура. Познание. М.: Рус. слов. 1996.
8. Diccionario de la lengua española (Real Academia Española 2002),
9.Испанско-русский фразеологический словарь (Э.И. Левинтова, Е.М. Вольф, Н.А. Мовшович, И.А. Буднидская 1985).


**İspan dilində rəng bildirən sözlərin frazeoloji birləşmələrdə simvolik özəlliyi**

**Xülasə**


Rənglər həyatımızın bütün sahələrindəmüəyyən əhəmiyyət kəsb edir: məişət, emosional, mədəni, ictimai-siyasi və s. Ona görə də rəng bildirən sözlərlə olan ispan frazeoloji birləşmələri mənbələri xalq həyatının müxtəlif sahələrini özündə əks etdirir. Istənilən dili dərindən araşdırıb öyrənmək istəyiriksə ilk öncə onun frazeologiyasına nəzər salmaq lazımdır. Çünki dilin ürəyi məs onun frazeologiyasıdır. Ispan dilinə olan marağın artmasını nəzərə alaraq, məqalədə ispan dilində geniş istifadə olunan, tərkibində rəng bildirən sözlər olan frazeoloji birləşmələrin yaranması və tərcümədə simvolik özəllikləri müxtəlif misallar əsasında geniş araşdırılmışdır. Rəngin insan həyatına böyük təsiri vardır, ona görə də hər bir rəng simvolik məna daşıyır.Bu da ona gətirib çıxardı kı, rənglər dilin leksik və frazeoloji sistemində də öz əksini tapdılar. Rəng bildirən sözlərlə istifadə olunan bu tip birləşmələr mədəniyyətlərarası ünsiyyətdə geniş istifadə olunur və bu və ya digər dilin zənginliyinin baris nümunəsinə çevrilir.


**The symbolic peculiarity of the words in the Spanish language that expresses in the idioms**

**Summary**


Colors are important in all aspects of our life: domestic, emotional, cultural, socio-political. Therefore, the sources of Spanish frazeological associations, which contain color, reflect the different spheres of people's life. If you want to explore any language deeply, you first have to look into its frazeology. Because the heart of any language is its frazeology. Given the growing interest in Spanish, in the article was widely used, with the use of frazeological expressions, which are widely used in the Spanish language, and the symbolic features in translation, on a wide range of topics.

Color has a great influence on human life, so each color has a symbolic meaning. It also led to the fact that the colors were reflected in the lexical and frazeological system of the language. These types of compounds used in color-coding words are widely used in intercultural communication and become examples of the richness of this or that language.

**K.B.Axundova**
Bakı Slavyyan Universiteti

# СОГЛАСНЫЕ ФОНЕМЫ СОВРЕМЕННОГО РУССКОГО И АЗЕРБАЙДЖАНСКОГО ЯЗЫКОВ

***Ключевые слова:*** *фонемы, консонантный состав, аллофон, состав, соединения, задний неб, звуки*
***Açar sözlər:*** *fonematik, müstəqillik, konsonant tərkibi, allofon, quruluş, birləşmələr, fonem, arxadamaq, alinma, səslər.*
***Key words:*** *phonemic, independence, consonantism, allophone, structure, combinations, phonemes, back-lingual, borrowings, sounds.*

В отношении количественного состава согласных фонем современного русского языка, так же как и состава гласных фонем, нет единого мнения среди учёных. Все учёные, занимающиеся русской фонетикой, выделяют 32 согласных звука в качестве самостоятельных фонем **<б, б', п, п', в, в', ф, ф', м, м', д, д', т, т', з, з', с, с', ж, ш, ч, ц, л, л', н, н', р, р', j, г, к, х>.** Спорной является фонематическая самостоятельность 5 согласных звуков: двух долгих шипящих **[ж:', ш:']** и трёх мягких заднеязычных **[к', г', х']**. Одни ученые в состав согласных фонем русского языка включают долгие мягкие шипящие **[ж:', ш:']**, но не включают мягкие заднеязычные **[к', г', х']** – получается 34 согласных фонемы. Другие в состав согласных фонем включают мягкие заднеязычные **[к', г', х']**, но не включают долгие мягкие шипящие **[ш:', ж:']**, получается 35 согласных фонем. Третьи в состав согласных фонем русского языка включают все 5 спорных с точки зрения фонематической самостоятельности согласных звуков : двух долгих мягких шипящих **[ш:', ж:']** и трёх мягких заднеязычных **[к', г', х']** – получается 37 согласных фонем. Есть и точка зрения, согласно которой в русском языке 36 согласных фонем, из числа согласных фонем исключается только долгий звонкий мягкий шипящий **[ж:']**.

Что касается фонематического статуса русских мягких **[к', г', х']**, мы придерживаемся точки зрения, согласно которой указанные согласные в современном русском языке превратились в самостоятельные фонемы и не могут считаться вариациями твердых **[к, г, х]**, ибо как все другие парные по твердости-мягкости согласные и заднеязычные мягкие **[к', г', х']** могут выступать, хотя и в основном в иноязычных словах, в сильной по данному признаку позиции и противопоставляться твердым заднеязычным (в положении перед гласными непереднего ряда **[а, о, у]**): **гяур, кяриз, кювет, гюйс, гюрза, ликёр** и т.д.

С артикуляционной точки зрения русские согласные описываются на основе следующих признаков:

1. Место образования согласных. По этому признаку согласные классифицируются с точки зрения активного и пассивного органов произношения: различаются губные, переднеязычные, среднеязычные и заднеязычные согласные. По пассивному органу губные согласные делятся, в свою очередь, на губно-губные **[б, б', п, п', м, м']** и губно-зубные **[в, в', ф, ф']**, переднеязычные - на переднеязычно-зубные **[д, д', т, т', з, з', с, с', ц, л, л', н, н']** и переднеязычно-небные **[ж, ш, ж:', ш:', ч, р, р']**, среднеязычно-средненёбный **[j]**, заднеязычные - на заднеязычно-задненёбные **[к, г, х]** и заднеязычно-средненёбные **[к', г', х']**.

2. Способ образования согласных. По этому признаку согласные делятся на смычные, щелевые и дрожащие. Смычные согласные в зависимости от характера смычки делятся на взрывные **[б, б', п, п', д, д', т, т', к, к', г, г']**, смычно-проходные **[м, м', н, н']**, боковые **[л, л']**, аффрикаты **[ч', ц]**. Щелевыми являются согласные **[в, в', ф, ф', з, з', с, с', ж, ш, ж:',ш:', j, х, х']**. Дрожащими являются две согласных фонемы **[р, р']**.

3. Участие голоса и шума. Все согласные делятся на звонкие и глухие. По данному признаку в русском языке 24 согласных образуют пары, различающиеся только звонкостью-глухостью: **[б – п, б'- п', в - ф, в'- ф', д – т, д'- т', з – с, з'- с', ж – ш, ж' – ш', г – к, г' – к']** . Вне пар находятся, с одной стороны, сонорные согласные **[м, м', н, н', л, л', р, р', j]**, которые не имеют парных глухих согласных, с другой - глухие шумные **[ч', ц, х, х']**, не имеющие парных звонких согласных.

4. Твердость-мягкость согласных. По данному признаку в русском языке выделяется 15 парных твёрдых-мягких согласных **[б – б', п – п', в –в', ф – ф', м – м', д – д', т – т', з – з', с – с', л – л', н – н', р – р', г – г', к – к', х – х']**, вне пар находятся только твёрдые согласные **[ж, ш, ц]** и только мягкие согласные **[ч', ж:', ш:', j]**.

В азербайджанском языке в отношении количественного состава согласных фонем также существуют разные точки зрения. Спорным является прежде всего вопрос о фонематической самостоятельности долгих согласных, а также заднеязычного глухого смычного **[к]**.

При установлении состава согласных фонем следует определить для них сильную позицию. Как пишет А.Ахундов, сильная позиция для согласных является их положение перед гласными или между гласными. Говоря о способах определения согласных фонем, Ахундов называет такой способ: если два рядом стоящих одинаковых согласных входят в одну морфему, то это одна фонема, если же они разбиваются морфемной границей, то это сочетание фонем. Это можно назвать морфемным критерием. Кроме этого, А.Ахундов для этих целей называет и слоговой критерий: если два рядом стоящих одинаковых согласных входят в разные слоги, то они не могут считаться одной долгой фонемой, а являются сочетанием двух самостоятельных фонем.

Здесь необходимо отметить точку зрения А.Алекперова по вопросу о наличии в азербайджанском языке долгих согласных. А.Алекперов в своей работе «Фонематическая система современного азербайджанского языка» указывает на некоторые неточности в изложении вопроса о консонантизме азербайджанского языка разны-

ми языковедами, в том числе по вопросу о долгих согласных. А.Алекперов не соглашается с мнением Н.К.Дмитриева о невозможности объяснения природы долгого **[d:]** в слове **addım** и **addamaq** фонетикой тюркских языков. А.Алекперов показывает, что слово **addım** вовсе не является неразложимым, оно расчленяется на две морфемы: **ad** и **dım**. Исходя из этого, он читает, что здесь налицо бифонемное сочетание. При этом он совершенно правильно исходит из положения о том, что если два гомогенных согласных встречается на стыке морфем, то их надо считать бифонемным сочетанием. В связи с этим А.Алекперов не соглашается с утверждением Ф.Кязимова о том, что в «в азербайджанском языке в корнях взаимно противопоставлены по качеству и количеству 39 согласных фонем, состоящих из простых и геминированных согласных» и считает, что « в пределах консонантного состава современного азербайджанского языка ни один долгий согласный не образует самостоятельной фонемы.

Интересным представляется мнение другого азербайджанского языковеда Ф.Вейсалли по вопросу о геминатах в азербайджанском языке. Ф.Вейсалли, отмечая морфемный критерий определения фонематического статуса долгих согласных звуков в азербайджанском языке, применяемый А.Алекперовым, упрекает его в том, что он несправедливо оспаривает факт наличия в азербайджанском языке таких слов, в которых имеется явная геминация. Он приводит примеры типа **saqqal, baqqal** и т.п., в которых, по его мнению, сочетания одинаковых согласных **<qq>** произносятся как разные: **saкqal, baкqal**. Но в таких парах слов как **əli - əlli, kələ - kəllə** удвоенные согласные встречаются в пределах одной и той же морфемы. Действительно, в современном азербайджанском языке невозможно расчленить приведенные морфемы **.**

Другим спорным вопросом в отношении количественного состава согласных фонем азербайджанского языка является вопрос о фонематической самостоятельности заднеязычного глухого **[к].** Одни языковеды не считают этот звук самостоятельный фонемой в азербайджанском языке**.** Так, А.Демирчизаде пишет о наличии в азербайджанском языке звука **[к],** но в таблице согласных фонем обозначает его в скобках, что может указать на фонематическую несамостоятельность этого звука**.** Другие выделяют его в качестве самостоятельной фонемы, но при этом справедливо указывают на то, что он, как правило, выступает в заимствованиях**.** Многие заимствованные слова со звуком **[к]** стали общеупотребительными и перестали в настоящее время ощущаться чужими словами. Н.А.Баскаков еще в 1952 году применительно к тюркским языкам писал, что в связи с обогащением словарного состава и заимствованием большого количества слов фонетические системы тюркских языков обогатились новыми фонемами**.**

Необходимо отметить, что в азербайджанском языкознании существовала точка зрения, согласно которой считалось, что в азербайджанском речевом укладе пока ещё нет в достаточной степени артикуляционных навыков для реализации звука **[к].** Противоположного мнения придерживается А.Алекперов, который пишет: «На самом деле этот звук никогда не был чужд азербайджанскому языку», «артикуляционных навыков» для звукопроизводства **[к]** в азербайджанского речевом укладе «даже больше, чем в русском, хотя азербайджанский язык и обогатился в наше время звуком **[к]** благодаря русскому языку»**.** В настоящее время в азербайджанском языке в позиции перед гласными непереднего ряда **[a, o, u]** могут произноситься как заднеязычный звонкий **[q],** так и заднеязычный глухой **[к],** т.е. имеется оппозиция этих согласных: **qayıt «вернись» – кayut «каюта», qonur «бурый» – кonus, qız «девочка, девушка» - aкın, quru «сухой» - кurort.**

Мы в данной работе принимаем точку зрения, согласно которой в азербайджанском языке имеется 24 согласных фонемы: **<b, p, v, f, m, d, t, z, s, j, ş, c, ç, l, n, r, g, k, y, q, к, x, ğ, h>.**

Согласные фонемы азербайджанского языка классифицируются по следующим признакам:

1. Место образования. Выделяются губные **<b, p, v, f, m>**, переднеязычные **<d, t, z, s, j, ş, c, ç, l, n, r>,** среднеязычные **<g, k, y>** и заднеязычные **<q, к, x, ğ, h>.**

2. Способ образования: выделяются смычные **<b, p, d, t, g, k, q, к>,** смычно-проходные носовые **<m, n>,** боковой **<l>,** аффрикаты **<c, ç>,** щелевые **<v, f, z, s, j, ş, y, x, ğ, h>** и дрожащий **<r>.**

3. Звонкость – глухость: выделяются звонкие и глухие согласные. Есть парные **<b-p, v-f, d-t, z-s, j-ş, c-ç, g-k, q-к, ğ-x>** и непарные звонкие **<m, n, l, r>** и непарные глухие **<y, h>.**

Итак, в русском языке в области вокализма спорной является фонематическая самостоятельность гласного звука **[ы],** в азербайджанском языке – фонематическая самостоятельность долгих гласных и дифтонгов. В области консонантизма – в русском языке спорной является фонематическая самостоятельность долгих мягких шипящих **[ш:', ж:']** и мягких заднеязычных **[к', г', х'],** в азербайджанском языке спорной является фонематическая самостоятельность заднеязычного глухого смычного **[к].**

**Литература:**

1. Алекперов А.К. Фонетика // Грамматика азербайджанского языка, Баку: Элм, 1971
2. Алекперов А.К. Фонематическая система современного азербайджанского языка. Баку: Элм, 1971
3. Ахундов А. Система фонем азербайджанского языка. Автореферат дис…. докт. филолог. наук, Баку, 1962.
4. Бондарко Л.В. Звуковой строй современного русского языка. М.: Просвещение, 1977
5. Буланин Л.Л. Фонетика современного русского языка. М.: Высшая школа, 1970
6. Вейсалли Я. Спорные вопросы азербайджанской фонологии (к постановке проблемы) // Ümumi dilçilik, Bakı, 2002.

7. Вербицкая Л.А. Русская орфоэпия. Л.: ЛГУ, 1976
8. Гасанов А.А. Среднеязычные и заднеязычные смычные согласные азербайджанского языка и заднеязычные смычные русского языка и их оппозиции // Тагиевские чтения, Традиционная международная конференция, Баку: БСУ, 2003
9. Грамматика азербайджанского языка. Баку: Элм, 1971
10. Идаятзаде Т.И. Сопоставительный анализ согласных фонем английского и азербайджанского языков. Автореф.дис…канд. филол.наук, Баку, 1963, Исследования по фонологии. М., 1966
11. Кязимов Ф.А. Система согласных фонем современного азербайджанского литературного языка // Ученые записки АПИИЯ, вып. I, 1958
12. Матусевич М.И. Современный русский язык. Фонетика. М.,: Высшая школа, 1976
13. Пинес В.Я. О фонеме /к/ в азербайджанском языке // Советская тюркология, 1973, № 4
14. Dəmirçizadə Ə. Müasir Azərbaycan dili. Bakı: Maarif, 1972

**Müasir rus və azərbaycan dillərinin samit fonemləri**

**Xülasə**

Rus və Azərbaycan dillərində fonemlərin sayı müxtəlif cür müəyyənləşdirilir. Rus dilində vokalizm sahəsində [ы] səsinin fonematik müstəqilliyi, Azərbaycan dilində isə uzun səsli səslər və diftonqların fonematik müstəqilliyi mübahisəlidir. Konsonantizm sahəsində isə - rus dilində uzun yumşaq tələffüz olunan [ш: ', ж:'] və yumşaq arxa damaq [к ', г', х '] fonetik müstəqilliyi, azərbaycan dilində isə arxa damaq kar [k] səsinin fonematik müstəqilliyi mübahisəlidir.

**Consonant phonemes of modern Russian and Azerbaijani languages**

**Summary**

In Russian and Azerbaijani languages the number of phonemes is determined differently. in Russian, in the field of vocalism, the phonematic independence of the vowel sound [s] is controversial; in the Azerbaijani language, the phonematic independence of long vowels and diphthongs. In the area of consonantism - in Russian the phonematic independence of long soft sizzling [ш: ', ж:'] and soft back lingual [к ', г', х '] is controversial, in the Azerbaijani language, the phonematic autonomy of the deaf-tongued blind end [k] is controversial.

**A.İ.İslamova**
Bakı Slavyan Universiteti

# AZƏRBAYCAN, RUS VƏ İNGİLİS DİLLƏRİNDƏ NEOLOGİZMLƏRİN MÜQAYİSƏLİ-LİNQVİSTİK TƏHLİLİ

***Açar sözləri:*** *Neologizmlər, alınma sözlər, ümumişlək sözlər, terminlər, leksik-semantik məna*
***Key words:*** *Neologisms, borrowed words, common words, terms, lexical and semantic meaning*
***Ключевые слова:*** *Неологизмы,заимствованные слова, общеупотребительные слова, термины, лексико-семантическое значение*

Müasir dövrümüzdə leksika daim yeni sözlərlə əvəzlənir. Həm Azərbaycan, həm də rus xalqı üçün hansısa sözlər öz dövrü üçün yeni sözlər hesab olunurdu. Böyük nəsil bir neçə onilliklər əvvəl *maqnitofon – магнитофон;univermaq– универмаг*; *televizor – телевизор* və s. sözləri neologizmlər kimi qəbul etmişlər [Həsənov, 1988, 22-23].

Elm və texnikanın inkişafı, həmçinin Azərbaycanın dünya birliyinə inteqrasiyası Avropa dillərindən külli miqdarda sözlərin dilimizə keçməsinə zəmin yaratmışdır. Məsələn, *telefon, mobil telefon, konqres, memorandum, panoram, kompüter, biznes, mikser, bill, sistern, aysberq, kross, printer, ofset, menecer, marketinq, lider, spiker, monitor,lobbi, boykot, piket*və s. kimi sözlərin dilimizdə qarşılığı, demək olar ki, yoxdur [Qarayev, 1989, 65].

Alınma sözlərin digər qrupu Azərbaycan və rus dillərində sinonimləri olan xarici mənşəli sözlərdir. Bu sözlərin dilə daxil olması artıqlıq yaradır və mənanın başa düşülməsinə mane olur. Onu qeyd etmək lazımdır ki, Azərbaycan və rus dillərində sinonim sözlər tam dəyişə bilər.

1. Musiqi mədəniyyətinə aid olan bir sıra hadisələrin, ümumiyyətlə mədəniyyətin adları. Məsələn: *xit – хит– məşhur mahnı*. İngilis dilində *hit* sözünün bir mənası da *şöhrət, müvəffəqiyyət* bildirir; *sinql – сингл – ayrı yazılmış mahnı*. İngilis dilində *single – tək, yeganə* mənasını bildirir. *Ayrı-ayrı sinqllarda yerləşən mahnılarda səslənir – Звучит и песни, существующие отдельными синглами; remeyk – ремейк (римейк) – düzəldilmə*. İngilis dilində *remake* həmin mənanı ifadə edir. *Евгений Попов написал ремейк тургеневского романа "Накануне"*.

2. Son dövrlərə aid bir sıra peşə və əmək fəaliyyəti növlərinin adları. Məsələn; *секьюрити – gözətçi*. İngilis dilindəki *security təhlükəsizlik, ehtiyatlıq, qoruma* mənasını ifadə edir; *provayder – провайдер – təchiz edən*. İngilis dilində *provider* sözü elə həmin mənanı ifadə edir; *rieltor –риелтор* – daşınmaz əmlakın satışı ilə məşğul olan aqent. Amerika ingilis dilində *broker – komisyoner – qiymətləndirici* sözü əmlakın satışı ilə məşğul olan mənanı ifadə edir; *killer - киллер – profesionalqatil*. İngilis dilindəki *killer – qatil*, *öldürən*, *to kill– öldürmək* sözündən götürülmüşdür və s.

Qəzet, reklam, elan mətnlərinin dillərində tez-tez ingilis sözlərinə rast gəlirik ki, burada da Azərbaycan və rus dillərinin ekvivalentləri tam dəyişə bilər. Məsələn, İngilis dilindəki *second-hand – ikinci əldən alınma* sözündən götürülmüşdür. *Hal-hazırda şəhərdə, hər bir ərazidə ən azı bir-iki second-handa rast gələ bilərsiniz – Сейчас в столице в каждом округе вы обязательно найдете один – два секонд-хенда* (Xəbər dünyası); *tineycer – тинейджер* – İngilis dilindəki *teen – ager*, *yeniyetmə*, *gənc* və ya 13 yaşdan 18 yaşa qədər qız. *Масштабы пивной зависимости тинейджеров, рожденной под влиянием безудержной рекламы пенного напитка, становятся угрожающими* və s.

Son onilliklərdə cəmiyyətimizin həyatında baş verən ciddi dəyişikliklərlə bağlı dilimizə belə sözlərin daxil olması təbii və qanunauyğun haldır. Əvvəla, bu sözlərin çoxuna dilimizin təbii ehtiyacı var. Həm də bu sözlərin böyük əksəriyyəti dünyanın, demək olar ki, bütün dillərində işlənən beynəlmiləl sözlərdir.

.

## Ədəbiyyat:

1. Cəfərov S. Müasir Azərbaycan dili. Leksika. Bakı, 2007, 376 s.
2. Егаровка К.Н. Типы лингвистических заимствований. АКД, 1971, 32 с.
3. Həsənov H.Ə. Müasir Azərbaycan dilinin leksikası, Bakı, 1988, 376 s.
4. Qarayev A.H. Müasir Azərbaycan dilində Avropa mənşəli leksik alınmalar. Bakı, 1989, 128 s.

## Comparative-linguistic analysis of neologisms in Azerbijani, Russian and English languages

### Summary

The present paper is dedicated to one of the urgent problems of lexics. Here neologisms have been analysed in comparison with forms in unrelated languages. For the first time comparative analysis of neologisms has been carried out in both Azerbaijani and Russian languages. Here also lexic-grammatical distinction and similarity of neologisms in both languages have been defined.

## Сравнительно-лингвистический анализ неологизмов в азербайджанском, русском и английском языках

### Резюме

Данная статья посвящена одной из актуальных проблем лексикологии. Здесь исследуются неологизмы в сравнении с эквивалентными формами в разносистемных языках. Впервые был проведен сравнительно-сопоставительный анализ в обоих языках.

**Ş. D. Məmmədova**
Bakı Slavyan Unuiversiteti
cicek7veliyeva@gmail.com

## FRANSIZ DİLİNDƏ SMS DİLİ

***Açar sözlər:*** *SMS, dil,üslub,danışmaq*
***Ключевые слова:*** *SMS,язык, стиль, разговаривать*
***Key words:*** *SMS, language ,style, speak*

Biz hər dili öyrənəndə dilin fonetik, qrammatik, leksik və.s. quruluşunu öyrənirik. Xarici dili öyrənən hər bir şəxs həmin dilin orfoqrafik, orfoepik, qrammatik, leksik dil qanunlarına çox ciddi yanaşır və onlara riayət etməyə çalışır və səhvlərin üzərində işləyərək daha dərin oyrənirlər. Lakin həmin dilin daşıyıcıları,öz dilləri daxilində, dil qanunlarına tamlıqda riayət etmirlər. Məsələn fransız dilini xarici dil kimi öyrənən hər hansı bir tələbə dili sırf xarici dil kimi öyrənir, nə qədər müasir dil öyrənmə vasitələrindən istifadə etsədə, həmin dilin daşıyıcısı kimi danışıb və başa düşə bilmir və yaxud elə bilir çox şey bilir.Lakin həmin xarici dövlətə səyahət etdikdən sonra dilin daxilində , danışıq üslubunda olan dəyişikliklərlə tanış olduqdan sonra , yalnız dili xarici dil kimi öyrəndiyin başa düşür və bir neçə il orada yaşadıqdan sonra dil daxili, danışıq dili ilə bağlı qaydalarla tanış olur, öz danışığında bu qaydaları tətbiq edir.

SMS dilində konkret dil daxilində baş verən, gənclərin etdikləri dəyişiklikləri göstərir.Yəni gənclər bir-birilərinə mesaj yazarkən uzun uzadı yazmamaq üçün qısaltmalardan istifadə edirlər. Bu da bəziləri tərəfdən müsbət , bəziləri tərəfdən isə mənfi qiymətləndirilir.

Onu da qeyd etmək lazımdır ki, SMS dili hamı tərəfindən eyni cür başa düşülmür, yəni bu yazı tərzi daha çox yeniyetmələr, tələbələr və cavan nəslin arasında yayılmış bir tərzdir. Tələbələr, yeniyetmələr vaxt qazanmaq üçün bundan istifadə edirlər və eləcədə çalışırlar ki, dörd səhifəlik mesajı bir səhifədə ifadə etsinlər və ona görə də qısaltmalardan istifadə edirlər.

Yaşlı və cavan nəsil arasında aparılan sorğular iki nəsil arasında fikir ayrılığını olduğunu ortaya çıxarır. Müxtılif fikirlər ortaya çıxır. Yaşlı nəslin nümayəndələri qeyd edirlər ki, mesaj yazmaq bizim üçün vaxt itirmək deməkdir. Yaşlı nəsil zəng etməyi daha üstün tuturlar. Cavanların isə öz dünyaları var. Mesaj yazmaq və xüsusi sms dilindən istifadə etmək kimi vərdişlər heç də bütün gənclərə şamil edilmir.Çünki bu kimi vərdişlər hec də bütün gənclər tərəfindən eyni cür başa düşülmür. Yəni xüsusi kodlarla yazılan mesajlarımn mənasını hamı açа bilməz .Yazışdığın tərəf də gərək bu vərdişlərə malik olsun ki, qarşılıqlı anlaşma baş versin. Bəzi gənclər isə qeyd edirlər sms yazmaq boş vaxt itirmək deməkdir.Yəni sms yazarkən çoz fikirləşməli olursan ki, qarşı tərəf səni başa düşər, yoxsa yox. Çox vaxt sərf edirsən ki, səni başa düşsünlər.Ona görə də kodlarsız yazmaq daha yaxşıdır ki, qarşı tərəf səni dəqiq başa düşsünlər.

Xüsusi sms dilindən istifadə edərkən , gənclər sözlərin həcmini qısaldaraq bir sms-in haqqını ödəyərək çox həcmli sms yaza bilərlər. Həm pula, həm də zamana qənaət edəcəklər. SMS dili haqqında müxtəlif fikirlər var.Bəziləri sms dilinin ənənəvi fransız dilini tamamilə işğal edəcəyindən narahat olurlar və bunun qarşısının alınmasaının tərəfdarıdırlar.Onlar qeyd edirlər ki, sms dilində yazmaqdansa , sms yazmaq sürətlərini artırmaq daha yaxşı olardı.sms dilini hamı yaxşı bilmədiyi üçün bu dildə oxumaq da çətinlik törədir.Yəni oxumağa çox vaxt sərf edilir və nəticədə vaxt itirilir.

Tələbələr mühazirə yazarkən müəllimin dediklərin yazıb çatdırmaq üçün xüsusi özlərinin başa düşdükləri qısaltmalardan istifadə edirlər.

Bu yad işarələr artıq azərbaycan dilində də özlünə yer tapmışdır. Məsələn: *salam- slm, Necəsən – ncsn, Hardasan –hrdn, Cavab – cvb, Universitet- Uni,Gecen xeyire qalsın -GX.*

İngilis dili beynəlxalq dil olduğu üçün ingilis dilindən alınma sözlərdən sms dilində çox istifadə olunur: OK, By.

SMS dili yeni mövzu, bömə olduğu üçün müasir təhsil sistemində dilin leksikologiyanın şöbəsində tədris olunur. Fransız dilində SMS dilində aşağıdakı qısaltmalardan istifadə olunur:

*Abito -à bientôt- görüşənə qədər,A2m1- à demain - sabaha qədər,Ama -à mon avis - mənim fikrimcə, Arffffff - je suis écroulé de rire - gülməkdən partlamaq, Bap- bon après-midi - gününüz xeyir,Biz - bises Bsr - bon soir - axşamın xeyir, Bisur – biensûr- əlbəttə,C-c'est dır,Ccho - c'est chaud – istidir,Cmal1- c'est malin - bu zərərlidir,*Dak *-d'accord-razıyam,DPch-dépêche- ələs,MDR-mort de rire - gülməkdən ölmək,Ppl - people-millət,PFFFFFFF - marque de mepris - nifrət işarəsi, éD – aider- kömək etmək,cu- see you (à bientôt)- görüşənə qədər,cdlt -cordiale-ment- səmimi, ürəkdən,dxnre - dictionnaire -lüğət, Fds- fin de semaine -həftə sonu,koman - comment- necə, koser - causer - söhbət etmək,np-no problem problem yoxdur , onckri - on s'écrit- yazışarıq,txt -texte- -mətn, up2u -comme tu veux (up to you) -necə istəyirsən,w/- avec (with) ilə ,w\- sans (without) to -sənsiz, wknd- week-end - həftə sonu, ya- il y a- var,aussi vite que possible -asap-mümkkün olan qədər tez, bientôt-bi1to-tezliklə,bisou -kiss, biz - öpüş,cet (te) - 7-bu,changer- chanG - dəyişmək ,concert- KoncR-konsert, contester-contST- mübahisə etmək, cruel - crul – amansız, danser- danC- rəqs etmək, désolé-Dzol- təəssüf, fou- ouf - dəli, frère- frR – qardaş, garçon -mek -oğlan, génial-Gnial- genial, habiter -abiT – yaşamaq,hasard -azar-təsadüf, hésiter-éziT- tərəddüd etmək, horreur- orEr- dəhşət,hôtel -otL – otel, imagine - imaJn- təsəvür et, impossible- posibl- mümkün deyil, indifférent- 1diféren müxtəlif,6T –cité- şəhərcik,7- cette bu, $-argent -pul, à demain-@-2m1 sabaha qəder, à plus tard - @+ -daha gec, aller- go - getmək,après-midi-aprM- günortadan sonra, aucun- oK1- heç*

*bir, aucune- Oqn- heç bir, aussi vite que possible- asap - mümkkün olan qədər tez, avant- av, B4 (before) - əvvəl, balader- balaD- gəzmək, bavarder - bavarD - çox danışmaq, bientôt-bi1to-tezliklə,bisou - kiss, biz - öpüş, changer-chanG* - dəyişmək

Sonda bele nətıcəyə gəlmək olarki, durğu isarələrsiz mətn anlaşılmaz olar. İstər yazılı istərsə də şifahi nitqdə insanlar bir-birilırini səhv başa düşərlər. Durğu işarələri istər yazılı, istərsə də şifahi nitqdə vacib rol oynayır.

**The language of texting in French**

**Summary**

From Ancient period started to use punctuation in the sentence. In the oral discourse we expresse the punctuation with the help of intonation and accent. But in written speech we do it with the help of punctuation. Adding the comma, we change the meaning of the sentence .The punctuation marks play important rol in the sentence.

**Язык СМС на французском языке**

**Резюме**

С конца античных времен начали использовать знаки препинания. В устной речи мы выражаем знаки препинания с помощью интонации и ударении. А в письменной речи мы выражаем это с помощью знаков препинания. В приложение с добавлением запятой мы меняем смысл предложения. Знаки препинания играют важную роль в предложении.

**M.Əmənov**
Bakı Dövlət Universiteti

# MƏHƏMMƏDHÜSEYN ŞƏHRİYARIN DİLİNDƏ TOPONİMLƏR

***Açar sözlər:*** *Onomastika, coğrafi adlar, toponimlər, komonimlər.*
***Key words*****:** *Onomastics, geographical names, toponyms, komonyms.*
***Ключевые слова***: *ономастика, географические названия, топонимы, комонимы*

Onomastikanın ikinci mühüm sahəsi toponimikadır. Onomastikanın yer adlarını öyrənən sahəsinə toponimika deyilir. Öz obyektlərinin çoxtərəfliyi və zənginliyi ilə əlaqədar olaraq toponimika müxtəlif yer adlarını öyrənir. Onlardan dördü: oykonimlər, oronimlər, hidronimlər, drionimlər xüsusilə mühümdür (1, s. 181).

Toponimlər Şəhriyarın dilində antroponimlərdən sonra ən çox işlənən onomastik vahiddir. Qədim zamanlardan başlayaraq Azərbaycan ərazisində azərbaycanlılarla birgə müxtəlif azsaylı xalqlar yaşamış və indi də yaşamaqdadır. Bu xalqlar da öz dillərində müxtəlif toponimik adlar yaratmış və bununla da Azərbaycan dilinin toponomik sistemi zəngin və mürəkkəb bir şəkil almışdır. Lakin qeyd etmək lazımdır ki, Azərbaycan dilinin toponomik sisteminin əsasında milli mənşəli onomastik adlar dayanır. Təbii ki, Azərbaycan dilində mövcud olan toponimik vahidlər eyni zamanda yaranmamışdır. Bu baxımdan dilimizdəki toponimləri üç müxtəlif qrupa ayırmaq olar: 1) ən qədim toponimlər; 2) qədim toponimlər; 3) yeni toponimlər.

Şəhriyarın dilində ən qədim və qədim toponimlərə aid nümunələr işlənmişdir. Şairin dilində işlənən bu toponimlər İran, Cənubi Azərbaycan, Şimali Azərbaycan və Qafqaz regionuna aid coğrafi adlardan ibarətdir. Şəhriyarın dilində ən qədim toponimlərə bir neçə nümunə işlənmişdir: Qafqaz, Şirvan. Məsələn: İgidlər yurdu <u>Qafqazım</u> // sənə məndən salam olsun // Sənin eşqindən İranda, hənuz səbri talan vardır (4, 97); Sabirinşəhrinə doğru qatarı çəkmədə sərvan, O xəyalımdakı <u>Şirvan</u>! (4, 64).

Şairin şeirlərində qədim toponimlərə də aid bir neçə coğrafi ad işlənmişdir: Təbriz, Şəki, Gəncə, Bakı, Tehran, Muğan və s. Məsələn: Sinə bir-dəşti <u>Muğandır</u> // quzu yan-yanə yatıb // Mənim ağlar gözümü orda Araz eyləmisən (4, 73); Xəccəsultan əmmə gəlib Təbrizə // Amma nə <u>Təbriz</u> ki, gələmmir bizə (4, 43); Rüstəm,<u>Bakıdan</u> söylə mənə, can sənə qurban // Təbriz sənə layiq nədi // Tehran sənə qurban(4, 49); Sanki Bakını, <u>Gəncəni</u>verdin mənə, qardaş // Tapdım elimi, arxamı, qurban sənə, qardaş (4, 66).

Toponimlər müxtəlif yollarla əmələ gəlir. Yaranma yollarına görə toponimləri aşağıdakı qruplara bölmək olar: a) antrotoponimlər; b) etnotoponimlər; c) zootoponimlər; d) hidrotoponimlər; e) fitotoponimlər; f) ictimai-siyasi xarakterli toponimlər; g) memuar-xatirə toponimlər; ə) təsviri toponimlər.

Tayfa, qəbilə adları əsasında yaranan toponimlər onomastik sistemdə etnotoponim, hidroterminlər əsasında yaranan toponimlər isə hidrotoponimlər adlanır. Şəhriyarın dilində etnotoponim və hidrotoponimlərin hər birinə aid bir nümunə işlənmişdir, digər qruplara aid heç bir nümunə ilə rastlaşmırıq. Etnotoponimlər : Qıṣçaq, Sulu yer. Məsələn: Əmioğluyan gedən gecə <u>Qıpçağa</u> // Ay ki çıxdı, atlar gəldi oynağa // Dırmaşırdıq, dağdan aşırdıq dağa // Məşməmixan göy atını oynatdı // Tüfənigini aşırdı şaqqıldatdı (4, 45); Heydərbaba, <u>Suluyerin</u> düzündə // Bulaq qaynar çay çəmənin gözündə (4, 39).

Toponimlər coğrafi adlar olaraq böyük və kiçik olmaqla müxtəlif ərazini əhatə edən obyektlərin adlarını əhatə edir, bura yol, dərə, respublika, düz, dövlət, təpə, rayon, meydan və s. adları daxildir. “Rus onomoloqu V.A.Nikonov toponomik təqdiqatın vəziyyətindən danışarkən yazır ki, coğrafi obyektlərin təbii şəraitə uyğun adlandırılmasının özünəməxsus qanunauyğunluqları vardır, lakin bu istiqamətdə toponimlər çox az öyrənilir” (2, s. 334).

Toponimlər əhatə etdiyi ərazinin böyüklüyü və kiçikliyinə görə aşağıdakı növlərə bölünür: 1) oykonimlər; 2) urbanonimlər; 3) oronimlər; 4) dronimlər; 5) xoronimlər. Oykonimlər dedikdə yaşayış məntəqələrinin adları nəzərdə tutulur. Yaşayış məntəqələrinə kənd və şəhər tipli yaşayış məntəqələri daxildir. Buna görə də oykonimlər özləri də iki əsas qrupda yerləşir: komonimlər və astionimlər.

Komonimlər adı altında kənd tipli yaşayış məntəqələrinin adları nəzərdə tutulur, lakin yalnız kəndlərin deyil, şəhər tipli qəsəbələrin də adları burda toplanır. Oykonimlərin böyük bir qismi astionimlərdən ibarətdir, komonimlər oykonimlərin çox az bir qismini əhatə edir. Şəhriyarın dilində həm komonimlərə, həm də oykonimlərə aid nümunələr işlənmişdir. Şarinin dilində işlənmiş komonimlər aşağıdakılardır: Şəngülava, Vərzəğan, Qıpçaq, Xoşginab, Behcətabad, Qarasu və s.

Məsələn: <u>Şəngülava</u> yurdu, aşıq alması // Gah da gedib orda qonaq qalması // Daş atması, alma-heyva salması // Qalıb şirin yuxu kimi yadımda // Əsər qoyub ruhumda hər zadımda (4, 38); Əmioğluyan gedən gecə <u>Qıpçağa</u> // Ay ki çıxdı, atlar gəldi oynağa // Dırmaşırdıq, dağdan aşırdıq dağa // Məşməmixan göy atını oynatdı // Tüfənigini aşırdı şaqqıldatdı (4, 45); <u>Vərzəğandan</u> armudsatan gələndə // Uşaqların səsi düşərdi kəndə // Biz də bu yandan eşidib biləndə // Şıllaq atıb bir qışqırıq salardıq // Buğda verib armudların alardıq (4, 43). “Vərzəğan” öz meyvəsinin bolluğu ilə seçilən bir kəndin adıdır. Bu kəndən qonşu kəndlərə də meyvə satmaq üçün gələrdilər. Şəhriyar bu kənddə uşaqların sevincini, buğda verib armud almalarını təsvir etmişdir.

Şəhriyarın dilində komonimlərlə müqayisədə astionimlər daha çox işlənmişdir: Bakı, Şəki, Şirvan, Meşgin, Qaradağ, Təbriz, Gəncə, Tehran, Sərab, Əhər, Kərbəla, Ərdəbil, Qüds, Kərəc və s. Məsələn: Çox da ki, Sərabın suyu var, yağ, balı vardır // Başı ərşə də çatdırsa, Sərab Ərdəbil olmaz (4, 100); O taydadı Şəki, Şirvan, Qarabağ // Bu taydadı

Meşgin, Əhər, Qaradağ // Bir-birini Arazdan almış soraq // Araz bizi ayırmadan dağlayıb // Son özüdə gecə-gündüz ağlayıb (4, 75).

Azərbaycan dilində Qaraçəmən və farsca Ğarəçən səslənən bu oykonim Şəhriyarın anadan olduğu Xoşginab kəndinin yerləşdiyi rayonun adıdır, həmin oykonim Azərbaycan-türk mənşəli "qara" sifətindən və "çəmən" isimindən yaranmışdır. Ağamusa Axundov bu oykonimi Azərbaycan-türk mənşəli hesab edir. V.Aslanovun fikrincə isə bu türkizm X əsrdən qabaq fars dilində işlək olmuşdur (3, s. 84).

Yuxarıdakı nümunələrdən gördüyümüz kimi şairin şeirlərində mənsubluq baxımdan Cənubi Azərbaycana, Şimali Azərbaycana, İrana, Ərəbistana aid astionimlər işlənmişdir. Toponimlərin növlərindən biri də xoronimlərdir. Xoronimlər dedikdə ölkə, rayon, respublika, vilayət adları nəzərdə tutulur. Şəhriyarın dilində oronimlərə aid xeyli nümunə işlənmişdir: Türkiyə, Azərbaycan, Amerika, Fransa, Norveç, İsveç, İran, Çin, Qaraçəmən və s. Məsələn: Elə turşadıb İranın ayranın ki // Gözəllər gözü yaşdı İran əlindən; Dən düşümüz İsveç,Norveçdən gələ, gəlməsə biz acımızdan ölək // Qapış-qapış bir çörəyi min bölək (4, 104); Türkiyəyə getdin unutdun məni // İstanbulun ovçusu səpdi dəni (4, 108); Qərnimiz qəhrəmanı, Rüstəmi-Dastan, Rüstəm // Nə qədər varsa bu dünyada Azərbaycan eli (4, 110).

Toponimik sistemin bir hissəsini də oronimlər təşkil edir. Oronimlərin tərkibində otlaq, dağ, sahə, təpə, meşə, düz, örüş və s. yer adları cəmləşmişdir. Bu gün də dilimizə məxsus olan oronimlər bir sistem şəklində araşdırılmamışdır. Şəhriyarın şeirlərində müxtəlif oronim nümunələrinə rast gəlirik: Heydərbaba, Səhənd, Qarakol, Damqaya, Ağa düzü, Şah dağ, Dəmavənd, Qaf dağı, Tur dağı, Savalan, Mişov dağı, Eynalı, Ərk, Qarakol və s. Məsələn: Heydərbaba, qeyrət qanın qaynarkən // Qaraquşlar sənnən qopub qalxarkən; Gəl qayıdaq, çıxaq Ağadüzünə // Keçək yənə məhəbbətin sözünə (4, 55); Baş ucaldıqca Dəmavənd dağından bac alarsan // Şir əlindən tac alarsan (4, 63) və s. Şəhriyarın dilində urbanonim və dronimlərə aid heç bir nümunə işlənməmişdir.

**Ədəbiyyat:**

1. Axundov A. Ümumi dilçilik.Bakı, "Şərq-Qərb", 2006, 280 səh.
2. Qurbanov A. Azərbaycan dilinin onomalogiyası, "Maarif" Bakı. 1988, 596 səh.
3. Quluyev E. Şəhriyarın fars divanında türk sözləri, Bakı, 2017, 158 səh.
4. Şəhriyar M. Seçilmiş əsərləri. Bakı, Avrasiya Press", 2004, 480 səh.

**Names are vocabulary of the languages of Mahammadhusein Shahriyar**

**Summary**

Names are considered one of these Onomastics single. The names studies place names and divided different groups. The names covers diferent territorial areas. The names were widely used in the language of Shahriyar. In this article we will be talking extensively about names.

**Имена в произведениях Мамедгусейна Шахрияра**

**Резюме**

Имя – это ономастическиу единицы. В статье рассматриваются группируются названия местностей. Представлен широкий круг названий. В произведениях М.Шахрияра имена используются довольно широко. В статье даются соответствующие выводы.

**Ü.Cəfərova**
Azərbaycan Dillər Universiteti
Ulker_j@hotmail.com

**BƏDİİ ƏDƏBİYYATDA DANIŞIQ DİLİNİN REAL NİTQDƏN FƏRQLİLİYİ**

***Açar sözlər**: Danışıq dili, şifahi nitq, funksional sistem, dil vasitələri*
***Ключевые славаие**: разговорный язьл, устная речь, функциональная система, языковые средства*
***Key words**: Spoken language, verbal speech, functional system, language device (s)*

Dilçilikdə bəzən "danışıq dili" və "şifahi nitq" anlayışları eyniləşdirilir. Əlbəttə, bu, materialın səciyyəsi, onun fərqləndirməyinin çətinliyi və başqa amillərlə bağlıdır. Dilçilikdə bu problemin həllinə dair fərqli mülahizələr mövcuddur. Bəzən də personaj nitqi ilə danışıq dili eyniləşdirilir.

Məlumdur ki, canlı danışıq hazırlıqsız baş verir. Beləki, buurada bir mövzudan digərinə keçidlər səciyyəvi haldır. Bu danışanın müxtəlif hal, vəziyyət, şəxs və s. ilə əlaqədar assosiasiyaların nəticəsidir. Lakin, bədii əsərlərdəki bu "hazırsızlıq" özü əslində bir hazırlığın nəticəsidir. Bu "hazırsızlıq" daha çox psixoloq üçün maraqlı olsa da, hər halda, linqvistik baxımdan da əhəmiyyətlidir və danışıq dilinin linqvistik xüsusiyyətlərini araşdırarkən nəzərdə mütləq bu məqam das tədqiqata cəlb olunmalıdır.

Xalqın öz mədəni ehtiyaclarını ödəmək üçün işlətdiyi, elmi və bədii əsərlərdə işlədilən normalaşdırılmış dil ədəbi dil adlandırılır. Bəzi tədqiqatçılar ədəbi dil və xalq dili anlayışlarının eyniləşdirilməyi düzgün qəbul etmir. Onlar "yetişməmiş" danışıq dilini sənətkarların təkmilləşdirdiyi dildən fərqləndirməyi təklif edir. Ədəbi dili ümumxalq, yanı milli dilin lüğət tərkibindən formalaşır. Burada işlənən sözlərin mənası və işlənmə məqamları, tələffüz tərzi və yazılış qaydası müəyyən prinsipə tabe edilir, sözdüzəltmə ümumi ənənəvi qaydada aparılır. Ədəbi dil dialektlərə, loru dilə, jarqonlara qarşı qoyulur. Ünsiyyətin məqsəd və şəraitindən asılı olaraq ədəbi dildə üslubi cəhətdən fərqlənmə gedir.

Ədəbi dilin iki – yazılı və şifahi növü var. Danışıq dilindən çox-çox sonralar meydana gəlmiş ədəbi dildə məhdud qaydalar, normalar hakimdir. Ədəbi dil daha sabitdir, daim dəyişilsə də ənənəvi qaydalar sabit qalır. Ədəbi dil cəmiyyətin bütün üzvləri üçün işlədilməsi zəruri olan dildir.

Danışıq dili xüsusi üslubi səciyyəli funksional sistem olmaq etibarilə ədəbi dilin qeyri-rəsmi bir forması kimi rəsmi formaya – kitab dilinə qarşı qoyulur və bir sıra xüsusiyyətlərinə görə rəsmi ədəbi dildən fərqlənir:

1) danışıq aktı hazırlıqsız baş verir;
2) danışanlar söhbətdə bilavasitə iştirak edirlər;
3) danışıq aktı qeyri-rəsmi şəkildə baş verir.

Danışıq dili özündə intellektual və emosional nitqi birləşdirir və dialoq formasında təzahür edir. Çox zaman "danışıq dili" və "dialoq nitqi" terminləri sinonim kimi işlədilir. Dilin bütün səviyyələrində (fonetika, leksika, morfologiya, sintaksis) danışıq dilinin özünəməxsus səciyyəvi xüsusiyyətləri vardır. Danışıq sözləri qeyri-rəsmi şəraitdə ünsiyyət zamanı işlədilir. Bunlar kitab sözlərinə qarşı qoyulur.

Bədii əsərlərdə, xüsusilə dram əsərlərində personajların nitqini ümumxalq danışıq dili nümunəsi kimi vermək asan və əlverişlidir.

K.B.Qasımov göstərir ki, realist yazıçı müvafiq konstruksiyaları tipik, *saf* formada götürmür, onları təsadüfi, fərdi xüsusiyyətlərdən, adi normalardan kənara çıxan xüsusiyyətlərdən təmizlənmiş halda alır.[7,s.15]

Deməli bədii əsərlərdəki danışıq dili canlı dialoq nitqinin surəti, fotosu deyildir. Dram və nəsr əsərlərindəki danışıq dili ifadələri, dialoq bədii yaradıcılıq süzgəcindən keçirilib, müəyyən dərəcədə səliqəyə salınır.

Ədəbi dillə danışıq dilini ayıran cəhətləri aydınlaşdırarkən bunu da əlavə etmək lazımdır ki, danışıq dilinə məxsus sintaktik vahidlər, adətən, çox qısa və yığcam olur; bunlardan qrammatik üzvlənmə ya heç mümkün deyil, ya da çox zəif şəkildə özünü göstərir. Bəzən sabit sxemin tərkibində buraxılmış üzvləri bərpa etmək mümkün olmur. Bu hazır formalar canlı danışıq dilinin ümumi mənzərəsini əks etdirir.

Danışıqda subyekt situasiyadan asılı olaraq bir sözlə bu və ya digər vəziyyəti və yaxud qısa ifadə ilə fikrini əks etdirə bilir. Lakin yazıda bunlar təfsilatı ilə göstərilməlidir.

A.M.Peşkovski göstərmişdir ki, danışıq dili ona görə təbii hesab edilir ki, fikrimizin hamısını nitqimizdə ifadə etməsək də, onu elliptiklik əsasında başa düşürük və fikir aydınlığı danışanların ifadə tərzindən də müəyyən edilə bilər.

Dildə müasir insanın analitik təfəkkürü ilə əlaqədar külli miqdarda üzvlənmiş qrammatik ifadə tərzi mövcud olduğu kimi, üzvlənməyən, sinkretizm səciyyəli vahidlər də çoxdur və bunlar qrammatik strukturdan məhrumdur. Bütün bu ifadələr – istər qrammatik cəhətdən formalaşanlar, istərsə də qrammatik strukturdan məhrum olanlar şəkilcə bir-birindən fərqlənsələr də, eyni qrammatik vəzifə daşıyırlar, başqa sözlə, hər iki ifadə tərzi müəyyən məlumat bildirməyə xidmət edir və bu məlumat alınan stimula qarşı hər hansı reaksiyanın ifadəsindən başqa bir şey deyildir. Məlumat özü də nitq stimulu ola bilər. Bütün ifadələrə (həm söyləm, həm də cümlələrə) xas olan bu xüsusiyyət, yəni onların reaksiya bildirməsi, nitq stimulu olması nitqə məxsusdur.

Yuxarıda deyilənlərə əsasən bir çox dilçilər həm söyləmləri, həm də cümlələri nitq vahidi hesab etmişlər. Nitq vasitəsilə verilən məlumatın adı üçün "cümlə" terminini işlədən A.Qurbanov yazır: "Cümlə müəyyən dil formasına malik olur və bütün digər dil formaları kimi o da nitq faktı deyil, bəlkə dil faktıdır... Lakin sözlərin birləşməsi formasına görə deyil, vəzifəsinə görə cümlə hesab edilir" [1,s.32]. Bu fikri belə bir cəhət də təsdiq edir ki, eyni bir dil strukturası

(ifadə tərzi, tərkib) müxtəlif funksiyalara malik ola bilər. Məsələn*, o sağlamdır cümləsi* daha geniş cümlə daxilində *(Mən inanıram ki, o sağlamdır)* bir cümlə üzvü kimi çıxış edir. Elə buna görədir ki, adətən, budaq cümlələr cümlə üzvlərinin adları ilə adlandırılır. A.Qurbanov yazır: "Cümlə ilə onun budaq cümlə olan hissəsi arasında dil ilə nitqin və ya forma" ilə "funksiyanın arasındakı fərq durur".

Danışıq dili haqqında bir sıra mülahizələr söylənilmişdir. Məsələn, prof. A.Qurbanov yazır: "Ədəbi dilə aid olmayan ünsiyyət formalarının cəmi danışıq dili adlanır. Danışıq dilinə eyni zamanda qeyri-ədəbi dil də deyilir. Danışıq dili xalqımızın, əsasən, ədəbi dili bilməyən və yaxud da az bilən təbəqəsinə xidmət edir" [1,s.29].

A.Qurbanov ədəbi dilin şifahi və yazılı formaları olduğunu qeyd edir və şifahi ədəbi dili iki yerə bölür: a) şifahi kitab dili; b) şifahi danışıq dili.

Ədəbi dilin bəzi konkret sintaktik məsələlərinə həsr olnmuş əsərlərdə yeri gəldikcə danışıq nitqi problemlərindən az-çox məlumat verilir. Lakin həmin yazılarda danışıq nitqi yeganə, başlıca tədqiqat obyekti olmadığından onların üzərində ətraflı dayanmağı zəruri hesab etmədik.

Bundan əlavə, Kazım Ziyanın "Səhnə dili haqqında", M.Ə.Əsgərovun "Natiqlik sənəti haqqında" kitablarında danışıq nitqinin bəzi məsələlərinə toxunulmuşdur.

"Beləliklə, "danışıq dili" termini ədəbi dil nümayəndələrinin bir-biri ilə qeyri-rəsmi ünsiyyət şəraitində istifadə etdikləri hazırlıqsız nitq anlayışını əks etdirir" .[Süleymanov S.S. səh 185]

**Ədəbiyyat:**

1. A.Qurbanov. Müasir Azərbaycan ədəbi dili.1-ci cild. Bakı Elm və Təhsil 2010
2. Z.Budaqova. Müasir Azərbaycan ədəbi dilində sadə cümlə. Bakı, 1997.
3. Vəkilova H.İ. Şifahi və yazılı danışıq üslubu,Dil və Ədəbiyyat Beynəlxalq Elmi nəzəri jurnal,Bakı 2014
4. S.S.Süleymanov. Nitq mədəniyyəti, Bakı,yazıçı, 2010
5. Qasımov K.B. "Conversational English-Azerbaijan,Azerbaijan English conservation book" Bakı, Elm, 1988
6. F.M.Ağayeva "Azərbaycan danışıq dili", Bakı, Maarif,1987
7. İsmayılova Dilarə "Typology of exercises for teaching dialogues" Bakı, Mütərcim,2004

**в художественной литературе разлличие разговорного языка от речи**

**Резюме**

Среди всех форм языкознаний художественная литература занимает особое место, потому что их целью является обьединение всех народов и наций

**Summary**

**DIFFERENCE BETWEEN SPOKEN LANGUAGE AND THE SPEECH IN LITERARY TEXTS**

Literary language is of particular importance to other forms of language since it associates all the members of the society, and all the nations

**N.X.Bağirova**
Azərbaycan Dillər Universiteti

## MÜASIR İNGİLİS DİLİNDƏ GƏLƏCƏK ZAMAN FORMALARININ SEMANTİKASI

***Açar sözlər:*** *kateqoriya, zaman, nisbi zaman.*
***Key words:*** *category, tense, relative tense*
***Ключевые слова:*** *категория, время, относительное время*

İngilis dilində futurallığın FSS-nin (funksional semantik sahəsinin) struktur modelini, futurallıq, modallıq arasında mövcud olan qarşılıqlı münasibətlərini, həmçinin ingilisdilli materialların əsasında aparılan futural situasiyalarının kommunikativ aspektlərini təhlil edərkən görürük ki, futurallığın formalaşmasında qrammatik vasitələr əsas rol oynayır və aparıcı yer tutur. Dil sistemində və kommunikasiya prosesində bu vasitələr söyləmin kateqorial semantikasının ifadə vasitələridir və cümlənin xarici sintaqmatik strukturunu formalaşdırır.

Dilçilik ədəbiyyatlarından bəllidir ki, müasir ingilis dilində futurallığın qrammatik ifadə vasitələrinə aşağıdakı konstruksiyalar aiddir:

1) "will" köməkçi feillə yaranan felin zaman kateqoriyası; 2) "mümkünlük, qabaqcadan demə, proqnozlaşma" və "*güman etmə*" mənaları ilə "*would, can / could, may / might" modal fellər*; 3) "*zərurilik, vaciblik*" mənaları ilə "*must, need, to have to, ought to, shall / should"* modal feillər; 4) *"to be going to"* feili ilə formalaşan futural konstruksiyası; 5) feillərin indiki zaman formaları - Present Continuous, Present Simple; 6) "*to be likely to, to be about to, to be surely to, to be to*" feilləri ilə formalaşan futural-modal konstruksiyalar; 7) "*istək, arzu, niyyət, fikir, ümid, intizar*" bildirən "*to want, to wish, would like, to be eager, to long, to be willing, to intend, to strive, to expect, cannot wait, to hope, to look forward*" feilləri ilə formalaşan konstruksiyalar; 8) *"planlaşdırma"* mənası olan *"to plan, to schedule, to decide, to settle"* feilləri ilə olan konstruksiyalar; 9) *"məhkum, duçar edilmiş"* və *"zərurilik, labüdlük"* mənaları olan *"to tend, to doom, to be bound to"* feilləri ilə olan konstruksiyalar; 10) *"söz, vəd vermə"* və *"hədə, təhdid"* mənaları olan *"to promise, to threaten, to warn, to caution"* feilləri ilə olan konstruksiyalar; 11) *"coming, upcoming, expected"* və başqa deyktik sifətləri ilə olan konstruksiyalar; 12) *"bride-to-be, meeting to take place, soon-to-happen"* felləri ilə formalaşan məsdər konstruksiyalar; 13) məqsəd bildirən məsdər konstruksiyalar, məsələn: *"He went back <u>to fetch some blankets</u>";* 14) *"there is / are to do"* işarə edən konstruksiya; 15) *"arzu, niyyət, məqsəd, meyl, səbəb"* mənaları ifadə edən strukturlar: imperativ cümlələr, *"to demand, to ask, to beg, to order"* və s. feilləri ilə formalaşan konstruksiyalar.

Futurallığın FSS-nin modelinin formalaşması zamanı futurallıq kateqoriyasının semantik mürəkkəbliyini mütləq nəzərə almaq lazımdır. Həmin xüsusiyyət futurallıq və modallıq kateqoriyalarının arasında mövcud olan xüsusi yaxın əlaqələrlə izah edilir. Bu xüsusiyyət sahənin xarici strukturuna təsir edir. Futurallığın FSS-nin çərçivəsində futurallıq və modallıq kateqoriyalarının arasında mövcud olan xüsusi qarşılıqlı münasibətlərinin ətraflı və dəqiq dərk olunması üçün sahənin xarici strukturuna ikisəviyyəli forma verilir.

Futurallığın FSS-nin strukturunun 1-ci sxeması




Futurallığın FSS-nin birinci futural-modal səviyyəsi nüvədən və öz funksional keyfiyyətlərinə görə ayrılmış və onlara daxil edilən müxtəlif vasitələrlə büruzə olunan bir neçə periferiya ərazilərindən ibarətdir. Həmin səviyyədə elə dil vasitələri nəzərə alınır ki, onlar üçün mətndə futurallıq anlayışının ifadəsi əsas və ya əsas funksiyalarından biridir. Bu o deməkdir ki, həmin vasitələrinin sayəsində gələcək zaman mənasının ifadəsi eksplisit şəkildə baş verir.

Adı çəkilən səviyyənin uzaq periferiya ərazisinə leksik və leksik-qrammatik vasitələr, o cümlədən zərflər və zamanın adverbial konstruksiyaları, zaman budaq cümlələri aid edilir, onlar isə, öz növbəsində, əlavə və yaxud dəqiqləşdirən funksiyanı icra edir.

Futurallığın FSS-nin ikinci modal-futural səviyyəsində öz modal mənasının nəticəsi kimi futurallığı ifadə edən dil vasitələri birləşdirilib, yəni həmin vasitələrinin sayəsində gələcək zaman mənasının ifadəsi implisit şəkildə baş verir.

Təqdim edilmiş səviyyə öz modal xarakteristikalarına görə fərqlənən seksiyalara bölünür. Bu bölmələr öz semantik xüsusiyyətlərinə görə müəyyən dərəcədə birinci səviyyə ilə kəsişir ona görə ki, birinci səviyyənin dil vasitələri mətndə modal xarakter daşıya bilər.

Əsas fərq ondan ibarətdir ki, birinci səviyyəyə daxil olunan vasitələr, gələcək zaman mənasının ifadəsini ya implisit şəkildə, ya da ikinci məna kimi həyata keçirir.

Müasir ingilis dilində futurallığın funksional semantik sahəsi monosentrik strukturdur. Onun mərkəzi qrammatik struktur və "will" köməkçi feil hesabına formalaşır. Gələcək zamanın ifadə dil vasitələrinin funksional nəzər nöqtəsindən "will" feili ilə yaranan formalar ən universal formalardır. Baxmayaraq ki, "will" ilə olan konstruksiya tamamilə qrammatikləşmiş kateqoriya deyil, o inkişaf etmiş paradiqmatik sistemə malikdir.

Nüvədən sonra gələn bölməni "to be going to" ilə yaranan konstrusiyalar, "Present Continuous" və "Present Simple" zaman formaları kimi dil vasitələri tutur.

Yuxarıda qeyd olunan formalarının vasitələri ilə ifadə olunan gələcəkdə baş verəcək hərəkət, hadisə, bir qayda olaraq, realizə olunmağa yüksək mümkünlüyə malikdir. Ola bilər ki, bu da formalarının əsas, ilkin funksiyası ilə bağlıdır. İndiki zaman, əslində, reallığın tərəflərindən biridir. Buna görə də indiki zamanın qrammatik formaları hərəkəti reallığa yaxınlaşdıran kimi qəbul edilir.

Misallara nəzər salaq:

*We're almost there, and I'm hungry. "Should I get the chocolate Oreo Mudslide? Oh, wait – White Chocolate Peanut Butter Truffle! What are you getting?" - I ask Sam. – "Is there anything with a longer name? I want that." – "Fine, I'll pick for you. You're getting the pineapple one."* (GL (Girls' life magazine), *November 2006, Vol. 13, Issue 2 , p.84*). *...the series has already tackled identity theft, blackmail and a hidden love child. Says costar January Jones: "It's fun to find out what crazy things we're going to get to do next."* (*People, August 18, 2008, p. 97*). This weekend you know you'll be working up the motivation to get off the couch – and to the gym. (*March 17, 2007, p.126*).

Nümunə kimi təqdim etdiyimiz cümlələrdə qeyd olunan konstruksiyalar gələcək istəyi (niyyəti) ifadə edir. Onlar vasitəsilə ifadə edilən mənaları öyrənən zaman, qeyd etmək lazımdır ki, müxtəlif vasitələrlə ifadə olunan gələcəkdə baş tutacaq hərəkətlər semantik cəhətdən konstruksiyaların əsas mənaları ilə şərtlənir.

Birinci misalda niyyət Present Continuous forması ilə ifadə edilir və dərhal baş verəcək hərəkətin xarakterini daşıyır. O, başqa misallarda ifadə olunan niyyətlərdən daha çox realizasiyaya yaxındır.

Birinci səviyyənin digər bölməsində futural-modal konstruksiyalarını təqdim edən dil konstruksiyaları mövcuddur. Onlar mətndə az işlədilir və yüksək modal məna çalarlarına malikdir. Bu qrupa *"to be about, to be sure, to be likely"* ifadələrlə yaranan konstruksiyalar, *"to be to" modal fellə və "there is to do"* modal konstruksiyası aiddir. Həmin konstruksiyalar hərəkətin güman olunmağı, mümkünlüyü çox parlaq ifadə olunan modal məna çalarlarına malikdir. Belə konstruksiyalar ilə işlənən cümlələrə nəzər salaq və onların funksional semantikasını təhlil edək*: The sun in Pisces has lowered your boredom threshold, and your home, school, and social lives are all about to drive you insane.* (*March 17, 2007, p.176*). *Sovereign Wealth Funds will continue to buy up big chunks of Western banks and blue-chip companies, as well as investing more broadly in a new range of countries and currencies (which is likely to make forex movements stronger and more unpredictable).* (*Newsweek, June 9, 2008, p. 28*). *Even with the world's heritage disappearing at an alarming rate, there are still amazing discoveries to be made.* (*Archaeology, January - February 2009, p.20*).

Gördüyümüz kimi, əlavə kontekstual elementlərinə əsaslanaraq, həmin misallar gələcəyə bir başa işarə edir.

Birinci misal ulduzların cədvəli mətnindən götürülüb və, beləliklə, bilavasitə gələcək hadisələrinin təsnifinə aidiyyatı var. Bu cümlədə "to be about" ilə yaranan konstruksiya təxirəsalınmaz hərəkətin gələcək zamanını ifadə edir.

İkinci cümlədə "will" ilə modal felin konstruksiya göstərir ki, söhbət gələcək zamandan gedir. Bu cümlədə *"to be likely"* ilə yaranan konstruksiyasının işlənməsi kostruksiyanın futural xarakterini müəyyənləşdirir.

Üçüncü cümlədə danışan insan gələcəkdə baş verəcək hərəkətin realizasiyasına öz əminliyini ifadə edərək qulaq asanı gələcəyə yönəldir. Danışan insana gələcək zamanın özünəməxsus inventarizasiyasını həyata keçirtməyə "there is" və ya "there are" + məsdər ilə yaranan konstruksiya kömək edir.

Birinci səviyyənin növbəti üçüncü bölməsində gələcək zamanın dil ifadə vasitələri mövcuddur və onlar təyin kimi fəaliyyət göstərərək təyin edilən obyekti gələcək zaman ilə əlaqələndirirlər. Onlara deyktik sifətlər aiddir, məsələn: "upcoming, coming, expectant, expected, future, on the way" və s. Bu növ sifətlər tez-tez reklam mətnlərində və başlıqlarında elliptik konstruksiyalarında işlənir. Aşağıdakı misallara nəzər salaq: *BABYMOUSE. The sassy mouse with attitude to spare! Get ready to rock with Babymouse: Rockstar! Coming this fall!* (GL (girls' life magazine), *November 2006, Vol 13, Issue* 2). *Coming soon in Archaeology* (*Archaeology, January - February 2009*).

Təsnif olunan bölməyə "soon" zərfi + məsdər ilə yaranan konstruksiyanı və yaxud təyin edilən isimdən sonra gələn məsdər ilə yaranan konstruksiyanı aid etmək zəruridir. Həmin konstruksiyalar təyin funksiyasını yerinə yetirir və gələcək hərəkətin keyfiyyətinə və ya təyin olunan subyektin yaxud obyektin vəziyyətinə işarə edir. Misal üçün "soon to be wife, the work to do" ilə yaranan aşağıdakı konstruksiyaları göstərmək olar: *To be launched in 2007, it won't capture light from other Earths. Instead, from a vantage far beyond the moon, it will chase their shadows.* (*National Geographic, December, 2004). Actress Diane Lane takes us on the remarkable journey that is her life – from a most unorthodox childhood to her second shot at love to her secret for being the sexiest soon-to-be-40-year-old in Hollywood.* (*In Style, January, 2005).*

Yuxarıda qeyd olunan feli kateqoriyalarından və futural-modal konstruksiyalarından fərqli olaraq həmin strukturlar cümlədə bilavasitə predikativ münasibətlərinin xarakterini təyin etmir, halbuki onlar müəyyən dərəcədə məlumata (mesaja) müəyyən temporal dinamikanı əlavə edir.

Qeyd olanları sxem şəklində təqdim etmək olar.



Və yaxud Futurallığın FSS-nin strukturunun 2-ci sxeması




FSS-nin strukturunda futurallığın qrammatik ifadə vasitələrindən bəhs edərkən qeyd etmək istəyirik ki, təqdim olunan sxema futurallığın FSS-nin birinci səviyyəsinin daxilində gələcək zamanın ifadəsində qrammatik vasitələrin tutduğu mövqeyi nümayiş etdirir.

Sonra isə, futurallığın FSS-nin periferiya ərazisində birinci səviyyəsinə leksik vasitələr və sintaktik konstruksiyalar daxildir. Mətndə onlar əlavə və dəqiqləşdirici funksiyanı yerinə yetirir, və, bir qayda olaraq, onların yoxluğu ifadənin kateqorial strukturunu dəyişmir.

Futural zərflik vasitələrinin adı çəkilən qrupa aşağıdakı dil kateqoriyalarını aid etmək olar:

- "tomorrow, later, soon" zaman zərflikləri;
- "next year, next time, next month, next week, next day, two days later" adverbial konstruksiyalar;
- "the day after tomorrow, at this moment, in the coming year, in ten years (days, etc.), after a month" önlüklü konstruksiyalar;
- "in 2012, at 7 p. m., on 2nd April, by 2 p. m. tomorrow" tarix və zaman göstəriciləri.

Futurallığın FSS-nin ikinci səviyyəsində mətndə futural ifadə vasitələrini təqdim edən vasitələr birləşir. Bu səviyyədə təhlilə futural sahənin sərhəddə olan bölmələri cəlb olunur, yəni elə bölmələr ki, onlar öz funksional-semantik məzmununa görə futural sahənin başqa sahələrlə, əsasən də modal sahələrlə kəsişməsində yerləşir. Sahələrin kəsişmə sahəsindən asılı olaraq aşağıdakı sərhəd bölmələri göstərmək olar.




Qeyd olunduğu kimi futurallığın FSS-nin ikinci səviyyəsini təşkil edən səkkiz bölmə mövcuddur. Hər bölmə futural kateqoriyası ilə müxtəlif dərəcədə qarşılıqlı təsir edən, müəyyən modallıq kateqoriyasına və ya semantik cəhətdən oxşar olan modal mənalarının qrupuna əsaslanır.

Birinci bölmə futurallıqla modallığın qovuşuq yerində yerləşir. Bu yarımbölməyə aid olan fellər, "istək, arzu" felindən başqa, "niyyət, üstünlük vermə" mənalarını bildirir. Buraya "to want, to wish, would like, to be willing, to love, to like" və s. felləri aid etmək olar.

Ayrıca bölmə "gözləmə, ümid etmə, can atma, intizar, məqsəd" kateqoriyasının əsasında formalaşır. Buraya "to hope, to expect, to be eager, to long, cannot wait, to look forward, to intend, to strive" və s. fellər daxildir. Həmçinin oxşar modal-futural mənalar cümlədə məqsəd zərfliyi funksiyasını yerinə yetirən məsdər konstruksiyasının köməyi ilə implisit məna kəsb edir.

Həmin sahənin ikinci səviyyəsində üçüncü bölməni planlaşdırılmış, qabaqcadan danışılmış mənada olan dil ifadə vasitələri tutur. Başlıca olaraq, buraya planlaşdırma ilə bağlı olan feillər aiddir, məsələn: "to plan, to schedule, to appoint, to figure, to design" və s. Bir qayda olaraq, qeyd olunan feillər subyektin istəyi, iradəsi və niyyətindən asılı və yaxın gələcək zamana yönəlmiş hərəkəti ifadə edir.

Növbəti bölmə "zərurət, labüdlükdir" sahəsi ilə sərhəddə yerləşir. O, bir sıra modal feilləri əhatə edir. Belə ki, "shall, should, must, ought to, need, to have to" və s. bu bölməyə aiddir. Bu bölmənin feilləri "zərurilik, lazımlıq, labüdlük, vaciblik, öhdəçilik, təəhhüd, gələcək vəzifələr" ifadə edir. Bu bölməyə daxil edilən bütün modal feillər nitqdə əsas modal mənalarının ifadəsi üçün işlənir, lakin onların istifadəsi zamanı hər bir kontekstdə gələcək zaman implisit məna kəsb edir.

"Zərurət, labüdlük" bölməsinə yaxın olan "zərurilik, məhkumluq" mənalarına əsaslanan digər bir bölmə mövcuddur. Buraya dil vahidləri olan "to doom, to tend, to be bound to" feillərini aid etmək olar.

Altıncı bölmə "güman etmə, mümkünlük" bildirən sahə ilə kəsişir. Bu bölməyə aid olan feillər "ehtimal, fərz, fikir, niyyət, imkan, şərait, fürsət, mümkünlük, yəqinlik, həqiqətə uyğunluq" mənalarını ifadə edir. Onlara "may / might, can / could" modal felləri aiddir.

Yeddinci bölmə futurallığın və modal mənalarının qarşılıqlı təsirinə əsaslanır, məsələn "hədə, təhdid, vəd etmə, söz vermə"anlamlarını ifadə edən feillər. Bu qrupa həmçinin "hədə-qorxu və söz vermə" mənalarında işlənən dil vahidləri olan "to threaten, to intimidate, to overhang, to menace, to impend, to promise, to hold out, to engage, to vow, to guaranty" kimi feilləri də aid etmək olar.

Xüsusi bir bölmə "sövq, meyl, məqsəd" mənalarını əks etdirən mikrosahənin ilə sərhədində formalaşır. Bu mənanı ifadə edən bütün qrammatik konstruksiyalar gələcək zamanı implisit şəkildə ifadə edir, çünki onlar gələcəkdə yerinə yetiriləcək hərəkətə işarə edir.

"Arzu, niyyət, istək, sövq, meyl, məqsəd" bildirən ifadə vasitələri dil elementlərinin geniş spektrini əhatə edir: imperativ strukturlar, modal feillər ilə formalaşan konstruksiyalar, "xahiş, məsləhət və tələb" bildirən feillərlə yaranan kostruksiyalar və s.

Sövqedici strukturlar müxtəlif praqma-kommunikativ strukturlara malik ola bilər. Onlar isə, öz növbəsində,

"əmr, komanda, xahiş, nəsihət, məsləhət, tövsiyyə" və s. mənaları olan ifadələri əhatə edir.

Qarşıya qoyulan kommunikativ vəzifədən və istifadə olunan dil konstruksiyalarından asılı olmadan bütün sövqedici ifadələr gələcək zamana implisit şəkildə yönəlir.

Futurallıq modallıq ilə sıx olan əlaqəsinə baxmayaraq yenə də temporallığın subkateqoriyasıdır. Bu onunla izah edilir ki, futurallıq deyktik vektor kateqoriyasıdır, yəni onun əsas kateqorial əlaməti ondan ibarətdir ki, o, hadisəni say hesabı məqamına və ya dövrünə aid edir. Bununla belə xarici modal xarakterik cəhətləri, nə qədər tətbiq olunan qrammatik formadan onlar ayrılmaz olsalar belə, yenə də semantik cəhətdən müstəqildir, yəni semantika səviyyəsində futural xarakterik cəhətlərindən fərqlənə bilər.

**Ədəbiyyat:**

***Azərbaycan dilində***

1. Abdullayev Ə.Ə. Mətn, məna və anlama (kommunikativ-koqnitiv təhlil), Bakı, DDA, BDU, 2001, 56 s.
2. Cahangirov F.F. İngilis və Azərbaycan dillərində modallığın struktur-semantik tədqiqi (müqayisəli-tipoloji tədqiqat), Bakı, DDA, 2006, 34 s.
3. Quliyev H.K. Müxtəlif sistemli dillərdə felin semantik təsnifatı, Bakı, Elm, 2005, 255 s.
4. Sadıqov R. Müxtəlif sistemli dillərdə obyektiv və qrammatik zaman əlaqələri, Bakı, Nurlan, 2004, 115 s.
5. Vəliyeva N.Ç. Müxtəlifsistemli dillərdə feli birləşmələrin tipoloji təhlili. Bakı, "Avropa" nəşriyyatı, 2008, 862 s.

***Rus dilində***

6. Курмаева И.И. Функционально-семантический анализ форм будущего времени глагола в английском и немецком языках. Филология и культура. Philology and Culture. № 2 (32), 2013, с. 29-32.
7. Рейхенбах Г. Направление времени, М., Едиториал УРСС, 2003, 360с.
8. Тураева З.Я. Категория времени, Время грамматическое и время художественное, М., Высшая школа, 1979, 219 с.
9. Фичи Джусти Ф. Об употреблении презенса СВ и о значении форм будущего времени. М., Индрик, 1996, с. 311-320.
10. Шелякин М.А. Модально-аспектуальные связи, ТФГ, Наука, 1990, 130 с.

**The Semantics of the Future Tense forms in Modern English**

**Summary**

On the basis of the English language's material the analysis of the communicative aspect of the future situations and the structure's models of the futurum's Functional-Semantic Field (FSF) and also the mutual connections between the categories of the futurality, modality and aspectuality gave to us the opportunity to come to the conclusion that the grammatical means plays a great role and has the leader place in the process of formation of the future time.

In the structure of the English language and in the process of communication these means of the statement are the means of expression of the categorial semantics and they form the exterior syntagmatic structure of the sentence. In Modern English the various categories and constructions are graded to the grammatical means of futurality's expression. Represented to your attention in this article there are different patterns of the futurum's FSF (Functional-Semantic Field)

**Семантика форм будущего времени в современном английском языке**

**Резюме**

Анализируя структурную модель семантики футуризма, ее взаимоотношения с футуризмом и коммуникативные аспекты футуристических ситуаций на основе материалов английского языка, мы приходим к выводу, что грамматические средства играют ключевую роль в формировании футуризма (будущего).

В языковой системе и процессе коммуникации эти средства являются средством выражения семантики речи и образуют внешнюю синтаксическую структуру предложения. Современный английский язык включает в себя различные концепции грамматических выражений футуризма. В данной статье описывается структура функциональной семантической области футуризма.

# Ə D Ə B İ Y Y A T Ş Ü N A S L I Q

**Ə.U.Əliyev**
Azərbaycan Dövlət Pedaqoji Universitetinin Ağcabədi r-n filialı

## NƏSİMİ FƏLSƏFƏSİ İNSANLIĞIN DƏRKİDİR

***Açar sözlər:*** *Allah, Nəsimi, kamil insan, eşq, həqq, kamillik*
***Key words:*** *God, Nasimi, perfect man, love, correctness, perfection*
***Ключевые слова:*** *Аллах, Насими, совершенный человек, любовь, справедливость, совершенство*

Nəsimi şəxsiyyətini, dünyaya baxış fəlsəfəsini, deyim-duyum bacarığını, ən yüksək şairlik simasını, əsrlərin daş yaddaşına nəqş edib, bu günümüzə çatdıran onun təkrarolunmaz yaradıcılığıdır. Nəsimi yaradıcılığı qəzəl, müstəzad, tərcibənd, məsnəvi, müləmmə, rübai və tyuğlarla cilalanmış bir xəzinədir. Onun şeirlərini oxuduqca belə qənaətə gəlirəm ki, Nəsimi öz şeirlərini bədahətən demiş və sonradan yazıya almışdır. Çünki şeirlərindəki xitabən söyləmələr, şeir dilinin canlı danışıq dilinə yaxın olması, çağırış xarakterli nidalar, ritorik suallar, əmr-fərman xarakterli deyim və duyumlar bu fikri söyləməyə əsas verir.

Nəsimi yaradıcılığının müəyyən məsələləri ədəbi nəzəri fikirdə öz əksini tapmışdır. Belə ki, 1.Ana dilində yazılan fəlsəfi qəzəlin banisi olması, 2.Azərbaycan türkcəsinin tarixi inkişafında Nəsimi yaradıcılığının müstəsna əhəmiyyəti, 3.Azərbaycan dilində ilk dəfə müstəzad, mürəbbe və tərcibənd yazan Nəsimi olmuşdur və s.

Lakin Nəsimi, sahili görünməyən ümmandır, onun sahilini fəth etmək çox çətindir. Bu isə Nəsimi dühası, Nəsimi böyüklüyüdür. Məncə, Nəsimi dünyasını, Nəsimi böyüklüyünü anlamaq insanlığın dərkidir. Odur ki, Nəsimi məkan və zamana sığmayan insanlığın kamillik zirvəsidir. Bunu şair özü də laməkan olması və kövnü məkana sığmadığı ilə bəyan edir:

Gərçi bu gün Nəsimiyəm, haşimiyəm, qureyşiyəm,
Məndən uludur ayətim, ayətə, şanə sığmazam. (səh. 320)
Məndə sığar iki cahan, mən bu cahana sığmazam,
Gövhəri-laməkan mənəm, kövnü məkana sığmazam.
Gərçi mühiti- əzəməm, adım adəmdir, adəməm,
Tur ilə künfəkan mənəm, mən bu məkana sığmazam.
Zərrə mənəm, günəş mənəm, çar ilə pəncü şeş mənəm,
Surəti gör bəyan ilə, çünki bəyana sığmazam. (səh. 319)

Nəsimi cəsarəti, mübarizliyi, o dövrdə deyilməsi mümkün olmayan "ənəlhəq" sözünü bəyan etmişdir:

Sirri-ənəlhəq söylərəm aləmdə, pünhan gəlmişəm,
Həm həq derəm, həq məndədir, həm xətmi-insan gəlmişəm.(səh. 335)

Nəsimi "ənəlhəq" deməklə insanı elə bir əlçatmaz zirvəyə ucaltmışdır ki, bu zirvəni heç bir bəşər övladı fəth edə bilməmişdir. Bu insanlıq zirvəsi Nəsimi fəlsəfəsinin qayəsini təşkil edir.Lakin o dövrdə Nəsimi fəlsəfi duyumunun dərkinin dərkedilməzliyi ucbatından dayaz düşüncəli fanatiklər tərəfindən onun qətlinə fərman verilmişdi. Bu o dövrün cahillik kodeksidir.Bu gün isə Nəsiminin qətlinə fərman verənlər onun dərk olunmasını təbliğ edirlər. Bu isə müasir dövrün kamillik zirvəsidir.

Həq təalanın kəlamı nurdur,
Görməyən ol nuri həqdə durdur.
Çün ənəlhəq söyləyən Mənsurdur,
Gəldi İsrafil əlində surdur.

Həq sözün gör ki, necə dürdanədir,
Həq sözünü bilməyənlər da nədir?
Cahilü nadan nə bilsin danə dür,
Danəyi dana bilir kim, danədir.(səh. 580)

O, "həq məndədir" dedikdə özünün kamil insan olduğunu və kamillik fəlsəfəsini bəyan edir, Allah məni öz timsalında yaratmışdır deyir. Dünyada bəşər övladının, kamil insanın varlığının əsl qiymətini, şüurluluq dərəcəsinin ən yüksək zirvəsini Nəsimi fəth etmişdir, bu nəsimi zirvəsidir. İnsanın varlığı Allahı, dini-məfkurə anlayışını, ideya və

ideologiyanı kəşf edir, onu yaşatmaqla yaşayır. Dünyada insan yoxsa bu anlayışların heç biri olmayacaq. Ona görə də Nəsimi kamil insanı dərk olunan, varlığın ən uca zirvəsi, kainatın bir zərrəsi və bütövlüyün əksi kimi tərənnüm edir.

Həq təala adəm oğlu özüdür,
Otuz iki həq kəlamı sözüdür.
Cümlə aləm bil ki, Allah özüdür,
Adəm ol candır ki, günəş üzüdür.

Adəm odur ki, cahanın canıdır,
Adəmə yol bulmayanlar fanidir.
Adəmin vəchinə sirri kainat,
Oxugil ki, qibleyi-rəhmanıdır.(səh. 585)

Nəsimi dünyaya bəyan edir, sanki fərman verir, mübarizliyə səsləyir, moizə oxumur.Nəsimi "mən" deyəndə mənəm-mənəmlik deyil, bəşər övladını, insanı nəzərdə tutur. İnsanın böyüklüyünü göstərməklə bərabər, onun dərk olunmasını təbliğ edir:

Ey Nəsimi, sən həqqi bil, həqqi iqrar eylə kim,
Çünki insanü bəşərsən, həq deyən insan mənəm!(səh. 396)

Nəsimi həqq əhlini insan və insanlıqdan kənar olanları şeytan adlandırır:

Nəfsin kim ki, bildi buldu həqqi,
Nəfsini bilməyənlər oldu şəqi...
Kim ki, bildi bunları insandır,
Bilməyən anı bil ki, şeytandır.(səh. 561)

Həmçinin Nəsimi gözəllik aşiqidir.Odur ki, o, öz sevgisini, bəşəri gözəli ilahi varlıq səviyyəsində tərənnüm etmişdir. Eşq sərkərdəsi olduğu üçün bu yolda canını fəda etmişdir:

Eşq ilə gəldi cəmiyi-ənbiya,
Eşqdir seyrü süluki-övliya.
Eşq ilə yola girərlər biriya,
Eşq ilə vasil olurlar tanrıya.(səh. 575)

Nəsimi ədəbi məktəbini tam varlığı ilə dərk edən və bu yolda Nəsimi ideyalarına dirsəklənən bayatı ustası Sarı Aşiq XVII əsrdə belə bəyan etmişdir:

Mən Aşiq soy iləndir,
Şahmar da soy ilandır.
Nəsimi tək bu aşiq,
Yolunda soyulandır.

Bununla da Sarı Aşiq Nəsimi soyuna və ideyalarına bağlılığını söyləməklə onun davamçısı olduğunu bildirmişdir. Nəsimi ədəbi məktəbi, ideyaları uğrunda dərisi soyulmaqla fəxr edilən ədəbi məktəb deyildir, bu ədəbi məktəb elə bir fəlsəfi duyum məktəbidir ki, bunu Nəsimi fəth etmişdir. Odur ki, bu fəlsəfi duyum hələ də tam dərk olunmur:

Heç kimsə Nəsimi sözünü kəşf edə bilməz,
Bu quş dilidir, bunu Süleyman bilir ancaq.(səh. 28)

Nəsiminin soyulması məsələsində Nəsiminin dözümlülüyü deyil, (dözümlülük qul fəlsəfi təlimidir) zülmün dərəcəsi, haqsızlığın ölçüsü avamlığın şiddəti, dərinliyi təbliğ olunmalıdır.

Nəsimi dinsiz, imansız, Allahsız deyildir. O dini elimləri dərindən bilən alimdir. Bəyan edir ki, dünyada nəyə baxarsansa orada Allahı gör, Allah səninlədir. Bu isə Allahın böyüklüyünü zaman və məkana sığmazlığıdır:

Hər nəyə kim, baxırisən anda sən allahı gör,
Qəncərü kim, əzm qılsan sümmə-vəchüllahı gör!
Bu ikilik pərdəsindən keç, hicabı rəf qıl,
Gəl bu birlik rövzənindən bax, bu sirrüllahı gör!(səh. 452)

Nəsimi bədii sual yaratmağı forma xatirinə deyil, bununla bir insan kimi, özünün kamilliyini nümayiş etdirir, həmçinin cəhalət cahillərini qəflət yuxusundan ayılmağa səsləyir və aləmin vəhdətdə olduğunu bəyan edir:

Nə səbəbdəndir qəmər gah bədr olur, gahi hilal,
Sirri-xurşidin əcəb başında sövdası nədir?!

Niçün olmuş mərkəzi-xaki əcəb biçün misal,
Ya bu taqi-sərnügunun səqfi-minası nədir?! (səh. 462)

Dörd müxalif cəm olanda bil ki, əsması nədir,
Elm ilə bilgil anın ismü müsəmması nədir?!

**Ş.Albaliyev**
AMEA-nın Folklor İnstitutu

## AZƏRBAYCAN XALQININ ETNİK MƏNSUBİYYƏTİNƏ DAİR

***Açar sözlər:*** *millət, Azərbaycan, Türkmən, dil, ərazi, etnos*
*Key words: people, Azerbaijan, Turkmen, language, territory, ethnos*
***Ключевые слова****: нация, Азербайджан, Туркмен, язык, территория, этнос*

Hər bir bəşər nəsli özünün soykökü, hansı nəslə, tayfaya, tirəyə, xalqa, millətə mənsub olması barədə, vətəni, dövləti haqqında doğru-dürüst və ətraflı məlumat əldə etməkdə maraqlıdır. Biz kimik, hardan gəlmişik, vətənimiz haradan başlanıb, haralaracan uzanır kimi suallar bədii düşüncəmizin də, elmi təfəkkürümüzün də daim diqqət mərkəzində olub. Təsadüfi deyil ki, Xalq şairimiz Sabir Xudu oğlu Rüstəmxanlı hələ sovetlər dönəmində 1986-cı ildə "Yazıçı" nəşriyyatında çapdan buraxılmış və o dövr üçün cəsarət göstərib "Qan yaddaşı" adlandırdığı şeirlər toplusuna "Ön söz yerinə" adlı bir şeirilə başlayıb:

Bu Vətən deyilən dünyam sirlidi,
Bir paytaxtı sevinc, bir paytaxtı qəm.
Bu Vətən torpağı çox qəribədi,
Hələ sərhəddini tapa bilmirəm.

...Dünyanın köksündən bir ümman axır,
Yayılır qolları, dəyişir adı.
Yolları Şərurda dayanan xalqın
Qəlbinin paytaxtı Kərbəladadı.

Dərbənd qəbristanı şəhərdən böyük,
Müdrik babamıza dayanacaqdır...
Bir gün Dədəm Qorqud mənə işimcə
Təzə ad verməyə oyanacaqdır!...

Üç bəndini misal gətirdiyim bu şeirin məzmununda əslində şairin "hələ sərhədini tapa bilmirəm" dediyi vətənimizin coğrafiyasına dair poetik ricətlər əks olunub. Bugünkü mərkəzi Bakı şəhəri olan Azərbaycan dövləti bir zamanlar bir ucu Dağıstandan başlamaqla Gürcüstan, Ermənistan, Türkiyənin Ərzurum, Qars, İqdır vilayətləri əraziləri, Ağrı dağı, İran, İraq, Suriya, Əfqanıstan, Xəzər dənizinəcən geniş bir miqyasda öz nüfuzunu, təsir dairəsini göstərmişdir. Mən yuxarıdakı misraları burada əbəs yerə yazmadım; burada "bir paytaxtı sevinc" deyiləndə Bakını, "bir paytaxtı qəm" dedikdə sovet dövründə əlimiz yetə bilməyən, ayağımız toxunmayan Təbrizi nəzərdə tutan şair "qəlbimizin paytaxtı"nın Kərbəla – İraq ərazisi olduğunu 1980-ci illərdə Sovet hökuməti zamanında cəsarətlə ifadə etmişdir. "Dərbənd qəbiristanı şəhərdən böyük" deyib müdrik babalarımızın burada yaşayıb-uyuduğunu diqqətə çəkməklə isə yenə də Dərbənd, bütövlükdə Dağıstan ərazisinin xalqımızın vətəni, dövlətimizin ərazisi olduğunun bədii inikasını vermişdir. Şeirin burada vermədiyim digər parçalarında da "İrəvan çuxuru", Qarayazı, Şumer mədəniyyətinin mövcud olduğu ərazilərin adları xatırlanmaqla Azərbaycanımızın, eləcə də ümumtürk dünyasının poetik coğrafiyası təsvir olunub.

Mən bu poetik örnəyi nümunə gətirməklə vətən, xalq anlayışının həm bədii düşüncəmizdə özünə mühüm yer etdiyini göstərmək istədim, həm də tariximizin poetik yaddaşımızda inikas olunduğunu diqqətə çəkmək istədim. Çünki biz tarixən öz keçmişimizi ən çox bədii lövhələr vasitəsilə yazılı və şifahi ədəbiyyatımızda yaşatmağa üstünlük vermişik. XX əsrin sonları və XXI əsr Azərbaycan poeziyasının tanınmış, ünlü nümayəndəsi olan Xalq şairi Sabir Rüsəmxanlı da bu klassik ənənəni yaşatmış, vətəndaş-şair kimi vətənpərvər ruhlu səsini ucaltmışdır. "Dünyanın köksündən bir ümman axır, yayılır qolları, dəyişir adı" deyən şair metaforik olaraq xalqı ümmana bənzədir; o ümman (o etnos, o türk dünyası) artıb-çoxaldıqca onun kökündən-gövdəsindən qolları-budaqları ayrılaraq dünyanın müxtəlif areallarına yayılır və bu şaxələnmədən, bu yayılmadan ümumi mənşəyə malik enoslar da törəyir ki, bu yayılan qollara-budaqlara, şaxələrə də müvafiq adlar qoyulur ("dəyişir adı" – şairin təbirincə dedikdə). Amma bu yeni adqoymalar (dəyişən adlar) təbii tarixi diferensiasiya nəticəsində baş verir ki, bununla da tarixi inkişaf prosesi labüd şəkildə özünü göstərmiş olur. Eyni zamanda dəyişən adlar, yeni-yeni etnosların yaranması mahiyyəti dəyişmir, rişələndikləri kökün-qaynağın bir bütövü – ayrılmaz tərkib hissəsi kimi mövcud olurlar. Bu, ona bənzəyir ki, bir babanın oğlu öz atasının adını yox, özünə aid olan başqa bir adı daşıyır, nəvəsi -nəticələri də buna müvafiq olaraq başqa-başqa adlar daşıyacaqlar, uzaqbaşı o nəvələrdən birinə, ya ikisinə ayrı-ayrı məqamlarda kökə (babaya, ataya) sədaqətin, bağlılığın, məhəbbətin əlaməti olaraq babanın adı qoyulub, baba (kök) ilə adaş(addaş, addaşıyıcısı) ola bilər. Deməli, oğulun atanın adını daşımaması da təbiidir, həm də bu zahiri addəyişikliyi oğulla ata, nəvə ilə baba arasındakı genetik bağlılığı da inkar etmir. İnkar onda oluna bilər ki, qan yaddaşı itə bilər, oğul öz doğma atasını, yaxud nəvə öz babasını (ümumilikdə isə cəddi-əbasını) tanıya bilməz. Onda isə, Allah eləməsin, ruhən qiyamət qopar, mənəvi dünya öz

məhvərindən uçub-dağılar. Çünki türk təfəkküründə atasından, babasından xəbərsizlik zatıqırıqlıq, haramzadəlik kimi ən aşağılayıcı təhqir, insanlıq üçün ən ağır ləkə sayılıb. Bir daha onu xatırladım ki, S.Rüstəmxanlı da məhz bədii sözün gücü ilə xalqımızın tarixinə güzgü tutmaq istədiyi şeirlər kitabının adını "Qan yaddaşı" qoymaqda belə bir məntiqə əsaslanıbdır ki, qan yaddaşına əsaslanmaqla xalqın kimliyini, Vətənin tarixini öyrənmək və tanımaq olar.

Türk xalqları bütöv bir ailə olub, həndəsi silsilə kimi uzanıb-artıb, çoxluq təşkil edirlər. Bəs biz azərbaycanlılar – hazırda azəri türkləri kimi adlandırıldığımız bizlər türk xalqları ailəsində hansı mövqedəyik? Tatar, türk, azəri, müsəlman, azərbaycanlı və başqa adlar altında tarixin müxtəlif çağlarında müxtəlif xalqlar və dövlətlər tərəfindən adlandırılıb-tanıdılan bizlər kimik? Tarixi vətənimiz, milli kimliyimiz hansı şərtlərlə müəyyənləşdirilir? Yuxarıda misal gətirdiyim poetik nümunədə Xalq şairimiz məhz öz fikirlərini bu yöndən bədii şəkildə izhar etmişdir. Bu sual ətrafında indiyədək bədii-publisistik və elmi istiqamətdən müxtəlif cür fikirlər səsləndirilmişdir. Məlumdur ki, hazırda çoxlu sayda türk xalqları olduğu kimi, türk dövlətləri də mövcuddur. Akademik Nizami Cəfərov "Türkologiyaya giriş" ("Elm və təhsil", 2016) kitabında bu barədə yazır:

"Yer üzündə bu gün iyirmidən çox türk xalqı mövcuddur ki, onların ümumi sayı (nüfuzu) iki yüz əlli milyona çatır: türklər və ya Türkiyə türkləri, azərbaycanlılar və ya Azərbaycan türkləri, uyğurlar, özbəklər, qazaxlar, tatarlar, türkmənlər, qırğızlar, çuvaşlar, başqırdlar, qaqauzlar, saxalar, qaraqalpaqlar, qumuqlar, tuvalar, qaraçaylar, bolqarlar, altaylar, noqaylar, şorlar, qaraimlər və b.

Türk xalqlarının sayının müxtəlif mənbələrdə müxtəlif rəqəmlərlə (əsasən iyirmidən iyirmi beşə qədər) göstərilməsi onunla bağlıdır ki, bir sıra türk mənşəli toplumların müstəqil xalq, yoxsa bu və ya digər türk xalqının tərkib hissəsi olması mübahisələridir, məsələn, Sibir tatarlarının, Axısqa türklərinin, sarı uyğurların...

Türk xalqlarının təsnifinin (bölgüsünün) "dərinləşdirilməsi" (ayrı-ayrı xalqlara ayrılması – Ş.A.) ilə yanaşı, ümumiləşdirilməsi təcrübəsi də vardır: oğuzlar, qıpçaqlar və karluqlar.

Bugünkü türklərin mütləq əksəriyyəti müsəlman olsalar da, xristian, iudaist, şamançı... türklər də mövcuddur.

Və Avrasiyanın geniş bir coğrafiyasında qədim dövrlərdən etibarən məskunlaşmış türk xalqları "türk dünyası"nı təşkil edirlər" (səh.5).

Göründüyü kimi, akademik burada türk xalqları, türk dövlətləri məsələsinə də, eyni zamanda onların dili və dini nöqteyi-nəzərdən fərqlənmələri və birlik ("Türk dünyası") təşkil etmələrinə də konkret və aydın şərh vermişdir. Bütün bunlarla yanaşı, bu türk xalqları içərisində bizim də yerimiz artıq ənənəviləşmiş şəkildə "azərbaycanlılar və ya Azərbaycan türkləri" kimi qeyd edilmişdir. Burdan da bir daha anlaşılır ki, biz yaşadığımız coğrafi regionumuz olan doğma vətənimizin – Azərbaycanımızın adı ilə adlandırılırıq: bir millət olaraq sadəcə ya azərbaycanlı kimi, ya da bu ad epitet kimi milliyyətimizin adına artırılmaqla bizim türk xalqları arasında milli mövqeyimizi – milli mənsubluğumuzu müəyyənləşdirir (bəlkə də, konkretləşdirir desək, daha düz səslənər). Vətənimizin adı olan Azərbaycan sözü çox əzəmətli səslənir və bu baxımdan vətənimizin adı ilə (birgə) milli kimliyimizin ifadə olunması bizə hardasa fərəh verir. Ancaq bununla bərabər onu da etiraf etməliyik ki, azərbaycanlı adı ilə bir xalq, millət kimi tanıdılmağımız müəyyən dövrlərdə siyasi və ideoloji məqsədlərə xidmət edib. Bu, bir tərəfdən türk adına xudpəsəndliklə yanaşılmanın nəticəsi olub, türk sözünün sıxışdırılıb aradan çıxardılmasına da xidmət edib. Eyni zamanda bu da həqiqətdir ki, müasir türk dili (Türkiyə türklərinin danışıq dili) ilə bizim danışığımız-yazımız arasında da sezilən fərqliliklər var və bu məqamda Türkiyə türkləri və Azərbaycan türkləri bölgüləri arasında, məncə, tam bərabərlik işarəsi də qoyub, bu dili də, o dili də birbaşa "türk dili" işarəsi (adı) altında təqdim etmək də hardasa özünü tam doğrultmur. Türk dili, tatar dili, qaqauz dili, türkmən dili və başqaları türk dilləri ailəsinə daxil olmaqla, eyni zamanda başqa-başqa adlar altında verilib bir-birindən fərqləndirildiyi kimi, məncə, Azərbaycan dili də məhz bu cür şərti bölgüdə verilməklə fərqləndirilməlidir. Çünki bizim danışdığımız Azərbaycan dilinin sabitləşmiş qrammatik – orfoqrafik (və leksik) normaları vardır. Amma bütün bunlara baxmayaraq, yenə də hardasa ilişik qalan məqamlar vardır ki, birbaşa dilin və millətin göstəricisi kimi çıxış etmədiyindən, azərbaycanlı (Azərbaycan dili) ifadəsi də öz yerinə-yuvasına tam oturmur.

""Azərbaycan dili" anlayışının tarixi" ("Elm və təhsil", 2017) monoqrafiyasının müəllifi fəlsəfə doktoru Aysel Qəribli yazır ki, "1930-cu illərin ortalarına qədər Azərbaycan SSR-in dövlət dili "türk dili" adlanırdı, lakin həmin illərə qədər də Azərbaycan türkcəsi (rusca: тюркский язык) Türkiyə türkcəsindən (rusca: турецкий язык) fərqlənir, bunlar ayrı-ayrı müstəqil dillər kimi qəbul edilirdi" (səh. 121-122).

Əslində, burada incə bir ştrix ifadə olunub ki, Azərbaycan dili türk dillərindən olsa da, müasir türk dilinin (Türkiyə türklərinin) eyni də deyildir. Deməli, dilimizin öz həqiqi adı ilə adlandırılması məsələsində həssas bir nöqtə var ki, həmin o zərif nüansı aşkarlayıb, həqiqəti öz yerinə bərpa etmək lazımdır. Bundan ötrü isə "Amerika kəşf eləmək" – özümüzdən nə isə abstrakt bir şey icad edib ortaya göydəndüşmə bir şey çıxarmamalıyıq. Bunun üçün bir az aydın təfəkkür işığında düşünməklə tarixə üz tutmaq və türkəsilli xalqlar arasındakı qlossogenetik və ümumiyyətlə genetik bağları, bundan irəli gələn ortaq folkloru, mədəni irsi analitik baxışla nəzərdən keçirmək yetərlidir ki, tarixin (xalqın) qaranlıqda qalan mətləblərinə işıq düşsün. Türk xalqlarının dövlətçilik və tarixi – coğrafi arsenalındakı mövqeyini ilk növbədə diqqətlə müşahidə eləsək, bir-birlərindən ayrı düşmüş soydaşlarımızın tarixi taleyini araşdırsaq və bu zaman ortaya çıxan tarixi gerçəklikləri – dil, mədəni-mənəvi dəyərlər və folklor incilərinin diqtə elədikləri ən ümumi ortaq məsələləri bir yerə cəm eləyə bilsək, onda hər şey öz yerini alacaq, həqiqət də - xalqımızın, millətimizin tarixi qədim adı da bununla bərabər üzə çıxacaq.

Mən yazımın əvvəllərində Azərbaycan dövlətinin (əslində Azərbaycan adı ilə adlandırılan etnosun, xalqın) tarixən mövcud olduğu, yaşadığı ərazilərin adlarını təsadüfən diqqətə çəkməmişdim. Akademik N.Cəfərovun çox-çox doğru olaraq diqqətə gətirdiyi və bu məsələnin uğurlu həlli üçün çox komponentli amillərin öyrənilməsinin

vacibliyindən bəhs açması bu məqamda fikrimizlə üst-üstə düşür: "Və "fundamental" hesab edilən problemlərin bir mühüm xüsusiyyəti də "çoxkomponentli" olmasıdır. Məsələn, bu və ya digər etnosun həm mənşəyi (etnogenezisi), həm də müxtəlif xalqlara bölünmləsi (diferensiasiya) probleminin izahı 1) etnoqrafiya, 2) etnocoğrafiya, 3) dünyagörüşü, 4) dövlətçilik, 5) dil, 6) ədəbiyyat və s. komponent və ya paradiqmalara eyni zamanda bir sistem olaraq baxılmasını tələb edir" (səh.8).

Bəli, məhz mən də yuxarıdakı etnik əlamətlərin göstəriciləri kimi çıxış edən komponentləri bir arada götürməklə türk xalqları içərisində Azərbaycan xalqının kimliyi – tarixən hansı türk etnosunu təmsil etməsini aydınlaşdırmaq niyyətindəyəm. Çoxdan bəri gizli şəkildə - yəni özüm öz içimə qapılaraq axtarışında olduğum bu məsələni çözmək istəyirəm. Yuxarıda qeyd etdim ki, bu yöndə nəsə göydəndüşmə bir icad eləməyə lüzum yoxdur. Sadəcə, olanı – tarixi həqiqəti, əslində isə gözümüzün qabağında olub, nədənsə görə bilmədiyimiz həqiqəti görüb dəyərləndirə bilməmiz bu məsələdə əsasdır. Bəlkə də, mənim deyəcəyim sirr (əslində hamının gördüyü, lakin fərqinə varmadığı sirr) ilk baxışda qəribə qarşılanacaq, ya sadəcə dodaq büzüləcək, güləcəklər, ya da ki, eh, bunu biz də bilirdik ki, deyəcəklər. Amma bilirdinizsə, niyə indiyədək bu məsələni qaldırmayıbsınız, özü də heç vaxt, heç bir dəfə də olsun! Əlbəttə ki, dilçilik, milli mənsubiyyətimiz kontekstində prinsipial bir problem kimi!..

Onu da qeyd edim ki, söyləyəcəyim fikir öz rüşeymlərini beynimə hələ orta məktəbdə oxuduğum illərdən (Sovet dövründən) atmışdı. Əlbəttə ki, görkəmli folklorşünasımız, dilçi və ədəbiyyatşünasımız professor Qəzənfər Paşayevin fədakar zəhməti sayəsində. Doktor Mustafa Ziyanın "İraq türkmanlarının Azərbaycandakı mədəniyyət səfiri" adlandırdığı Qəzənfər müəllimin Kərkük mahnılarını, bayatılarını 1970-80-ci illərdə kitabça şəklində Azərbaycanda çap etdirdiyi dövrlərdə mən bu dildəki sehrə aludə olmuşdum, kərküklərin-türkmanların birbaşa azərbaycanlılar (Azərbaycan-türkləri) olduğunu beynimə yerləşdirmişdim. Dahi şairimiz Məhəmməd Füzuli nəsli mənşəcə kim idi? Türkman deyildimi?

Müasir Azərbaycan ərazisi Rusiyanın işğalında, farsların işğalında olduğundan, onun yerli əhalisi olan biz azərbaycanlıların (Azərbaycan türkləri adlandırılan bizlərin) öz soy-kökümüzdən uzaqlaşdırılması da bir siyasi məqsəd olmuş, milli mənsubiyyətimiz qəsdən təhrif edilərək gah tatar, gah müsəlman (fikir verin, dini mənsubiyyəti etnik mənsubiyyətlə qarışdırma halları da olub!), gah Azərbaycan, gah da ki, ən yaxşı halda Azərbaycan türkü və ya sadəcə türk adlandırılmışıq. Beləcə, milliyyətimizin adı qəsdən təhriflərə məruz qalmış, dövlətimizin də bir vaxtlar adında ifadə olunmuş ulu, əzəmətli Türkman adı bizlərə, demək olar, unutdurulmuşdu. Yaxşı ki, İraq, Suriya ərazisində yaşayan soydaşlarımıza bir etnos, xalq, millət olaraq öz adlarını unutdura bilməmişlər. Bəlkə də, görkəmli dilçilərimizdən olan Azərbaycan dili tarixçisi H.Mirzəzadə "İraq ərazisində yaşayan azərbaycanlıların dili haqqında bəzi mülahizələr" məqaləsində bunu dolayısı yolla da olsa, ifadə etmiş, professor Əbdüləzəl Dəmirçizadə isə XV-XVI əsr Azərbaycan ədəbi dilində Cənubi Azərbaycan və Bağdad (Kərkük) şivə xüsusiyyətlərinin üstünlük təşkil etməsini göstərib, İraq-türkman ləhcəsini Azərbaycan dilinin Cənub qrupu dialekt və şivələri sırasına daxil edərkən də Sovet senzura və qadağalarından ötüşmək məqsədilə fikrini bir qədər üstüörtülü istiqamətdə söyləmişdir.

Əgər professor Qəzənfər Paşayev birbaşa iddia edirsə ki, "Çəkinmədən demək olar ki, əsrlərlə başqa xalqlar əhatəsində qalan, məhz buna görə də qədim leksik və fonetik göstəricilərini daha çox saxlayan İraq türkmanlarının ləhcəsi "Kitabi-Dədə Qorqud"un dil xüsusiyyətlərini tamamilə əks etdirir. "KDQ"da yer alan onlarca sözün indinin özündə belə Kərkük dolaylarında işlək olması, daha doğrusu, həmin sözlərin yalnız həmin mənada işlənməsi tutarlı dəlil-sübutdur" (səh.21).

Professor İraq türkmanlarının öz dillərini qoruyub saxlamalarının səbəbini "başqa xalqların əhatəsində yaşayıb qalması" kimi maraqlı bir amillə əlaqələndirir. Bu, həm də o mənaya gəlir ki, türkman xalqı bununla-yəni başqa xalqların əhatəsində olmaqdan müsbət halda yararlanmaqla özlərinin milli varlıqlarını bir növ, "izolyasiya" etmişlər. Milli kimliklərini millətin, xalqın adı məsələsindən tutmuş, ta digər milli-mənəvi məsələlərəcən qoruyub hifz etməyi bacarmışlar. Bunun bir səbəbi də yəqin ki, İraqın İslam ölkəsi olmaq etibarilə digər xalqlar kimi türkmanlara da zorakı təzyiq göstərməməsilə - milli mənafelərinə zidd ola bilən təbliğatyönlü dövlət tədbirləri aparılmaması ilə izah oluna bilər.

Eyni zamanda Qəzənfər müəllim qeyd edir ki, İraq türkmanlarının ləhcəsi Dədə Qorqudun dil xüsusiyyətlərini tamamilə özündə əks etdirir. Madam ki, bizə yazılı halda gəlib çatan ən qədim şifahi ədəbi abidəmiz "KDQ"nın dil xüsusiyyətlərini özündə əks etdirirsə, onda bu zaman "İraq türkman ləhcəsi" ifadəsindən yox, birbaşa geniş mənada ulu, qədim türkman dilindən söz açılmalıdır. Yəni ki, türkman dili ləhcə səviyyəsində olsaydı, onda nəhəng bir abidənin dil xüsusiyyətlərini özündə əks etdirməkdə aciz olardı. Axı ləhcə hansısa bir dilin məhəlli formada qol-budağıdır. Məhz elə bu məqamda Ə.Dəmirçizadənin də, H.Mirzəzadənin də fikirlərinə qayıdıb, onların cümlələrində də təshihlər aparmaq lazım gəlir. Bu zaman "Azərbaycan dili" ("Azərbaycan türk dili") kimi tanıdılmış milli dilimizin məhz geniş mənada türkman dili olduğu üzə çıxır. Belə olduqda "Azərbaycan dilinin dialekt və şivələri" ifadəsi "Türkman dilinin dialekt və şivələri" formasında işlədilməli və təsnifatlar da bu qaydada aparılmalıdır. Bu deyilənlər heç də H.Mirzəzadənin, Ə.Dəmirçizadənin fikirlərinin üstünə kölgə salmır, əksinə, onların sovet dövründə bir priyom olaraq dolayısı ilə ifadə etdikləri fikrin bu gün müstəqillik zamanımızda birbaşa öz adı ilə adlandırılmasına (və ifadəsinə) xidmət edir. Başqa sözlə, "Azərbaycan dili" ifadəsinin "Türkman dili" ilə əvəzlənməsi ilə tarixdəki siyasi-ideoloji antitürk təbliğatın nəticəsi kimi ortaya çıxmış ad (və termin) dolaşıqlıqları aradan qalxmış olar.

Böyük türk alimi Məhəmməd Fuad Körpülünün İraq türkmanlarını "Oğuzcanın azəri ləhcəsini qonuşan türklər" adlandırmasında isə milli kimlik və dilçilik məsələsi baxımdan böyük hədəfi sərrast nişan almışdır: türkmanları məhz

Azərbaycan türkü millətinin sinonimi kimi götürməklə eyni xalq-millət olduğumuz bir daha bu şəkildə də öz təsdiqini tapmışdır.

Kərkūklü tədqiqatçı Əta Tərzibaşı da bu barədə çox böyük həqiqəti belə ifadə edir: "Bizim türkman ləhcəsi azəri ləhcəsinə türk ləhcəsindən daha yaxın, bəlkə də əkiz qardaşlar olmaqla bərabər, bütün bu ləhcələr uzun bir tarix boyunca çeşidli səbəblərin təsiri ilə bir-birindən xəbərsiz olaraq gəlişdikləri halda aralarında görkəmli fərqlər bilinməmişdir". (Bax: Əta Tərzibaşı. Yazı dili, qonuşma dili. "Qardaşlıq" dərgisi, N-4. Bağdad, 1962, səh. 26-27).

Fikir verin, türkman ləhcəsi (əslində dili) ərazicə və həm də səslənişcə (türk-türkman ifadələri baxımından) özünə bir qədəm də yaxın olan türk ləhcəsinə yox, məhz bizim "azəri ləhcəsinə" – Azərbaycan dilinə daha yaxın - əkiz qardaşlar hesab olunur Türkman aliminin fikrincə. Həm də diqqət etsək, burada incə bir tarixi nüansa da işarə edilir: bu dillər (türkman və Azərbaycan dili) uzun bir tarix boyu müxtəlif səbəblər ucbatından bir-birlərindən xəbərsiz olaraq – yəni bu xalqlar sərhədlərin bir-birlərinin üzünə qapalı olmaları səbəbindən öz aralarında bir-birlərilə təmas qurmadan, ünsiyyət əlaqəsində olmadan da bu dillər arasında görkəmli (yəni nəzərəçarpacaq dərəcədə ciddi) fərqlər yaranmamışdır. Bu fikir isə bir daha türkman və Azərbaycan dillərinin bir-birlərinə sinonim olduğunu, bunların vahid xalqın eyni dili olduğunu isbat edir.

Professor Qəzənfər Paşayev də bu məsələyə çox aydın münasibət sərgiləyir: "Lakin nə kəsilən yollar, nə də ayrılığa gətirib çıxaran illər bu elatın dilinə təsir edə bilməmişdir. O vaxtdan yazı dili Osmanlı türkcəsi kimi qəbul olunsa da, Əta Tərzibaşının göstərdiyi kimi, danışıq dili və folkloru Azərbaycan türkcəsini təmsil etmişdir. Doğrudan da, İraq-türkman ləhcəsinə, onun folkloruna və xalq havalarına bələd olan türk, Azərbaycan və eləcə də iraqlı alimlər bu elatın ləhcəsinin Azərbaycan dili ilə üst-üstə düşdüyünü, eyni kökdən olduğunu, folklor və xalq havalarının fərqlənmədiyini qeyd edirlər" (səh. 18-19).

Fikir verin, yazı dili Osmanlı türkcəsi kimi qəbul olunmuş türkmanların danışıq dili və folkloru Azərbaycan türkcəsi olaraq dəyişilmədən qalmışdır. Bu fakt özlüyündə hər şeyi açıb ortaya qoyur. Biz azərbaycanlıların ədəbi dilə əsaslanan yazılı dili, ədəbiyyatı olsa da, soykök olaraq türklüyümüzü-türkman adımızı yadırğamış, yaddan çıxarmışıq; iraqdakı soydaşlarımıza isə yazılı dil olaraq rəsmən Osmanlı türkcəsini qəbul etdirsələr də, nə öz dillərini, folklorunu, nə də milli adlarını-kimliklərini nə unutmuş, nə də dəyişmişlər. Bu, taleyin xoşbəxtliyidir. Digər bir tərəfdən isə türk, Azərbaycan və iraqlı alimlər də bu kimi milli-mənəvi komponentlərə söykənərək türkman və Azərbaycan dilinin (və xalqının) eyni olduğunu təsdiqləyirlərsə, onda nədə tərəddüd etməliyik?

Professor Qəzənfər Paşayevin aşağıdakı fikirləri əslində çox böyük mətləblərdən xəbər verir:

"Biz soy-kökündən ayrı düşən, ərəb və kürd xalqları əhatəsində yaşayan, sayları iki milyon yarımı keçən iraq türkmanlarının folkloruna bu müstəvidən baxır və qiymətləndiririk. Onlar özlərini də, bizi – azərbaycanlıları da "türkman" adlandırırlar. Əslində, vaxtilə biz də türkman adlandırılmışıq. Bu etnonimin "ulu türk", "əsl türk" mənasında işləndiyini bildirən İbrahim Kafesoğlu, Ərşad Hürmüzlü və başqaları da göstərmişlər" (səh.13).

Bu cümlələrdən bir daha məlum olur ki, iraqlı soydaşlarımız-qardaşlarımız həm özlərini, həm də bizi türkman kimi tanıyırlar. İkincisi, professor özü də birbaşa bildirir ki, "əslində, biz də vaxtilə türkman adlandırılmışıq". Bu, o deməkdir ki, biz daşımış olduğumuz milli kimlik göstəricimiz olan "türkman" adımızı sonradan tarixin labirintvari dolaylarından keçərkən itirib, onu "azərbaycanlı" adı ilə əvəz eləmişik. Üçüncüsü, "türkman" adının-etnoniminin "Əsl türk", "Ulu türk" mənasını verməsi isə bir daha ona sübutdur ki, biz azərbaycanlılar nəinki sadəcə türk xalqıyıq, əsl türkü təmsil edən ulu türklərik. Və bütün digər türk xalqları da məhz bu ulu türkdən – türkmanlardan diferensiasiya nəticəsində qopub ayrılmışdır. Başqa cür ifadə etsək, müasir türk xalqlarının hamısı bir baba türk (tayfası) olaraq türkmanlardan törəyib-çoxalmış və ayrı-ayrı türksoylu qollara-budaqlara şaxələnmişlər.

Ümummilli liderimiz Heydər Əliyev də "Qardaşlıq" dərgisinə müsahibəsində belə bir həqiqəti vurğulamışdır ki, "tarixi araşdıranda gördüm ki, Güney Azərbaycan, Quzey Azərbaycan və İraq türkmanları bir bütövün parçalarıdır" ("Qardaşlıq" dərgisi, İstanbul, N-8. 2000. səh.4).

Bir məsələyə də toxunmaqla yazımı yekunlaşdırmaq istərdim. Suriya ərazisində, Colan bölgəsində də toplu halında soydaşlarımız yaşayır ki, onlar da türkman adı ilə tanınırlar. Ərəbləşdirilməyə məruz qalan Colan türkmanlarının 50-60 min nəfər arasında olduğu göstərilir. Ümumiyyətlə isə bu gün Suriyada 3,5 milyon türkman yaşayır ki, onların da 2 milyonu ana dilində danışa bilmir. Folklor araşdırıcısı Əli Şamil "Colan türkmanları" (folklor və etnoqrafiya örnəkləri) adlı kitabında ("Elm və təhsil", 2014) göstərir ki, "Suriyada türkmanları yaşadıqları bölgələr üzrə beş yerə ayırırlar. Lazkiyə bölgəsində yaşayanlara Bayır-Bucak türkmanları, Hələb və Rakka bölgəsində olanlara Hələb türkmanları, Hama və Humus bölgəsində yaşayanlara Hama və Humus türkmanları, Şam bölgəsində yaşayanlara Şam türkmanları, Colan təpələrində yaşayanlara isə Colan türkmanları deyirlər" (səh.46).

İstərdim ki, Əli Şamilin İbrahim Saleh adlı Colan türkmanına verdiyi "İbrahim bəy, Azərbaycan türklərinə Colan təpələrində, eləcə də Suriyada yaşayan soydaşlar haqqında bilgi verməniz xahiş edirəm" sorğusuna cavabdan bir hissəni burada təqdim etməklə bir daha Azərbaycanımızdan uzaqlarda yaşayan dini bir, dili bir, qanı bir qardaşımızın kim olduğunun fərqinə varaq:

- Türkmanlar Suriyanın hər yerinə dağılıblar: ən uzaq qibləsindən Şəbələ qədər. Bunlar 1 milyondan çox, milyon yarıma yaxındır. Onların bəzisi dilini itirib. Ərəb olub, bəzisinin dili sağlam qalıb. Dilin həpsi Azərbaycan türkcəsi. Biz nerədə danışırıq, bizə deyirlər: "Azərbaycan türkcəsində danışırsınız?" Bununla fəxr edirik. Şükür Allaha, dilimiz bir, dinimiz bir, aramızda ayrılıq yox. Allah-təala bizə yol versəydi, görsəydik Azərbaycanı. Görsəydik Bakını, görsəydik oradakı qardaşlarımızı. Türklərin həpsi ilə də qonuşa bilsəydik, bilərdik haradan olduğumuzu...

...Bizim millət Azərbaycanda oturub, Azərbaycanın adətlərini alıb. Bizim yanımızda çox adətlər var (ki, bunlar) bildirir Azərbaycanda oturmağımızı...” (səh.68-69).

Suriyada Azərbaycandan təcrid olunmuş halda yaşayan və heç anadilli məktəb-filan görməyən bir türkman qardaşımızın danışığından onların babalarının bir vaxtlar “Azərbaycanda oturduqları” – yəni Azərbaycanda oturub-yaşadıqları bəlli olur. Danışıqları da türkman dili – “Azəri türkcəsi...”

Bir daha gördüyümüz kimi, vətəndən uzaqlarda yaşayan soydaşlarımız öz milli kimliklərini bildirən türkman adını öz üstlərində qoruyub saxlaya bilmişlər: İraq türkmanları, Suriya türkmanları, Colan türkmanları... Yaşadıqları yerlərin adları – ünvanları və milli mənsubiyyəti bildirən kimlikləri – türkmanlıqları birlikdə ifadə edilməklə harada yaşadıqlarını və milliyyətcə kim olduqlarını parolsayağı nişan verirlər ki, hələ varıq, hələ ki, yaşayırıq. Bəlkə, bu paroldan biz də özümüzə verəcəyimiz “biz hansı xalqıq?” sualının cavabını alaq?!.


**К вопросу этнического происхождения азербайджанского народа**

**Резюме**

В статье рассматривается вопрос национального происхождения азербайджанского народа. Дается обяснение почему азербайджанские тюрки на разных этапах исторического развития называют по-разному. В связи с тем, что постоянно происходили историко-географические изменения, название азербайджанского народа должно изучаться сквозь призму исторического, полтического, языкового фактора. Уже доказано, что туркмены, проживающие на территории Ирака и Сирии также относятся к азербайджанцам.



**About the ethnic affiliation of the Azerbaijani people**

**Summary**

In the article the problem of the national identity of Azerbaijan people is investigated for the first time. The clarity is brought to the position of Azerbaijan Turks which called with various names since different periods of history.

With the principle of geographical territory being forgetting the name of old nation known as Azerbaijani people in the result of various distortions is explained on the base of social-political-historical and language facts. It is proved that the Turkmens living in Syria, Iraq are the separate parts of a whole, Azerbaijan people.

# PEDAQOGİKA

**У.Б.Мехралиева**
Бакинский славянский университет

## ТЕХНОЛОГИИ РАЗВИТИЯ МЕДИАКУЛЬТУРЫ В СИСТЕМЕ НЕПРЕРЫВНОГО ОБРАЗОВАНИЯ

***Ключевые слова:*** *медиакультура, возрастной этап, медиаобразования, дошкольники, младшие школьники, старшеклассники*
***Açar sözlər:*** *media mədəniyyəti, yaş mərhələsi, media təhsili, məktəbəqədər uşaqlar, kiçik məktəblilər, böyük məktəblilər*
***Key words:*** *media culture, age stage, media education, preschoolers, younger schoolchildren, great pupils*

Современный мир и жизнь человечества уже невозможно представить без медиа, т.е. без средств массовой информации и коммуникации (сюда относят печать, прессу, телевидение, кинематограф, радио, звукопись и систему Интернет). Сегодня медиа – это одна из важнейших сфер в жизни людей всей планеты, средства массовой коммуникации проникли уже во все сферы жизни общества, и отдельного человека. Медиа охватив собой все культурное пространство превратилась в основное средство производства современной культуры. Таким образом, в результате процессов, происходящих в современном обществе, сложилась особая форма культуры – медиакультура, которая стала и средой обитания человека. Особенно сильно влиянию медиакультуры подвержена молодежь. Популярность медиакультуры у молодежи определяется множеством факторов: а) во-первых, медиа используют весь широкий спектр возможностей воздействия на зрителя; б) во-вторых, основу медиакультуры составляют зрелищно-развлекательные жанры, которые используют общие для всех видов массовой культуры методы воздействия на потребителя. Отметим, что обладая столь впечатляющим потенциалом воздействия на человека медиа не всегда способствуют гармоничному развитию личности. Это особенно заметно на примере современной молодежи, которая с рождения входит в мир медиа и уже не может представить себя без общения с экраном. Многочисленные ток-шоу, игры и развлекательные передачи, кинокартины, которые зачастую не отягощены никаким смыслом, мощная агрессивная реклама – все это неизменная составляющая современных медиа.

Таким образом, медиакультура формирует специфическую целевую аудиторию – обезличенную, легко поддающуюся внушению, примитивную по своим интеллектуальным запросам, привлечь интерес к которой можно только рассмешив, напугав или сыграв на ее физиологических потребностях. И эта аудитория становится надежным потребителем однообразной по своему формату, шаблонной по содержанию. Здесь при этом изменяется мышление человека, оно принимает стереотипные формы, у такого человека исчезает или вообще не успевает сформироваться критический взгляд на медиапродукцию. В этих условиях очевидно, что медиакультура личности должна складываться и формироваться не спонтанно, а целенаправленно, чтобы весь огромный потенциал современных средств коммуникации мог быть рационально использован на благо человека и общества. В то же время задача образования заключается не только в формировании критического мышления, но и в умении отстаивать свои медиапредпочтения. Наиболее важной задачей медиакультуры является не только творческое освоение медиаинформации, ее критическая переработка, но и наиболее активно создание собственных Интернет-ресурсов и формирование представления о механизмах их создания.

Медиаобразовательная ситуация в России проблема подготовки подрастающего поколения к жизни в эпоху информационного общества слабо актуализируется в контексте как дошкольного, школьного, так и вузовского образования. Анализ теории и практики зарубежного и российского медиаобразования показывает, что в мировой медиапедагогике преобладают воспитательные, обучающие, креативные подходы к использованию возможностей медиа.

Итак, главные этапы реализации большинства медиаобразовательных подходов выглядят так:

А) получение знаний об истории, структуре, языке и теории медиа;

Б) развитие восприятия медиатекстов, чтение их языка, активизация воображения, зрительной памяти, развитие различных видов мышления (критического, логического, образного, интуитивного и т.д.);

В) развитие креативных практических умений на материале медиа. Каждый из данных этапов можно воплощать в жизнь автономно, однако медиаобразование будет, скорее всего, однобоким.

Так, в одном случае на первый план выйдет информация, а в другом критическое мышление, а в третьем практические умения. Хочется отметить, что медиапедагоги разных стран активно используют различные способы учебной деятельности такие, как пересказ медиатекста, перечисление действующих лиц, событий, описание отношений, эмоций, анализ структуры медиатекста, языковых особенностей, определение места произведения и т.д.

Самыми популярными у школьников и молодежи в настоящее время являются экранные медиа – телевидение, кинематограф, видео, DVD. Именно с экрана начинается знакомство ребенка с медиамиром. Современный дошкольник и школьник встречаются с мультимедиа практический ежедневно, играя в компьютерные игры самых разных направлений и уровней сложности, работая с обучающими программами. Мультимедийные средства в молодежной и школьной среде чаще всего выступают как: источник информации, средство общения, форма отдыха и развлечения, техническое средство обучения.

Изучение массовой коммуникации в ракурсе освоения медиакультуры на разных возрастных этапах развития личности имеет свою специфику. Процессы развития, связанные с переходом от детства к взрослости, составляют основное содержание и отличие всех сторон становления личности: физического, умственного, нравственного, социального, духовного. Поэтому процесс организации медиаобразовательной деятельности, выбор определенных методик и технологий неразрывно связывается с возрастными особенностями каждого этапа развития ребенка.  Основой для изучения особенностей организации медиаобразовательного процесса этапах развития выступает изучение возрастной психологии и особенностей медиаобразования дошкольников, школьников и студентов.

Младший школьный возраст характеризуется перестройкой всех познавательных процессов (восприятия, внимания, памяти, воображения, мышления, речи), а также приобретением качеств свойственных взрослым людям. Как и дошкольники, учащийся младших классов отличается подвижностью, непоседливостью, импульсивностью поведения, неустойчивостью внимания, но роль ученика накладывает на него новые обязательства, вместо игровой деятельности на первый план выходит учеба, которая вовлекает ребенка в сложную умственную деятельность, чтобы получить новые знания.

Отметим, что просмотр телепередач, видеофильмов, компьютерные игры в Интернет являются важнейшим компонентом повседневной жизни ребенка как дошкольного, так и младшего школьного возраста. По результатам исследований видно, что старшие школьники и школьники (особенно младшие) читают газеты и журналы гораздо меньше, чем дети старшего возраста. Для этой возрастной категории характерно увлечение комиксами. Младшие школьники искренне верят в чудеса и волшебства, поэтому подавляющее большинство из них с удовольствием смотрит сказочные и фантастические фильмы. Младшие школьники так же, как и взрослая аудитория, выступают в качестве целевой аудитории телевизионной рекламы. Они после просмотра рекламного рамка активно воздействуют на родителей с требованием приобрести рекламируемое новшество. В детской рекламе ставка делается на особенности детского восприятия: яркость, необычность формы, волшебство. Дети младшего школьного возраста часто идентифицируют себя с телевизионными, компьютерными героями: идентификация помогает ребенку лучше понять характер, поступки персонажей. Однако возникающее порой несоответствие между тем, что увидено на экране, и тем, что происходит в реальной жизни, приводит некоторых детей в смятение, у них возникает ценностный конфликт, которые впоследствии могут оказать негативное влияние на формирование мировоззрения и т.д. Поэтому необходимость развития медиакультуры начинать уже с дошкольного возраста, так как современный ребенок к моменту поступления в школу имеет опыт общаться с техникой (телевизор, компьютер, видео, мобильный телефон и т.д.).

Выделяется Л.М.Баженовой ряд задач, которые положены в основу медиаобразования: развитие восприятия, художественная деятельность, осмысление результатов восприятия и оценка экранных произведений: освоение знаний о языке, выразительных средствах экрана. Среди основных форм и методов медиаобразовательной работы со старшими дошкольниками и младшими школьниками выделяют игры, творческие задания на медиаматериале, викторины, конкурсы, диалог, беседы (1, 43).

Чтобы овладеть технологией обучения подростков в сфере медиакультуры Е.А.Бондаренко рекомендует педагогам освоить следующие частные технологии:

1. Организацию благоприятного психологического климата и системы внутренних мотиваций для занятий медиакультурой в малых творческих группах;
2. Диагностику общего развития подростков, хода учебного процесса и его результатов;
3. Управление учебно-познавательной деятельностью учащихся;
4. Самоанализ результатов обучения и т.д. (2, 32)

Обучение в старших классах школы соответствует возрасту от 15 до 17 лет. Этот период ранней юности, где завершается физическое созревание, а в социальном плане ранняя юность – завершающий этап первичной социализации личности. В этом возрасте ведущим видом деятельности продолжает оставаться учеба – средство подготовки к будущей трудовой жизни. Этот период является формирования личностных качеств и самосознания.

Этот период – рост самостоятельности, открытие самого себя, это время активного мировоззренческого поиска, смысла жизни решаются проблемы нравственного выбора, утверждается мир нравственных понятий. В юношеском возрасте возрастает интерес к художественно-творческой деятельности на медиаматериале: любительской видеосъемке, созданию собственных фильмов с привлечением компьютерных программ. Например, современные мультимедийные программы позволяют старшеклассникам самостоятельно программировать пространственно-временную реальность экрана, создавать динамичные зрительные образы средствами мультипликации (анимации) и т.д (3, 65).

Еще одной важной проблемой старших школьников, связанной со средствами массовой информации и коммуникации являются коммуникативные барьеры, возникающие в результате чрезмерного ухода в мир SMS.

Студенчество – важная веха в жизни подрастающего поколения, ответственный этап жизни будущего специалиста. Очень трудно представить себе молодого человека, современного студента, не вовлеченного в медиапространство (4, 98).

Итак, практически все стороны жизни современных дошкольников, школьников, молодежи тесно связаны со средствами массовой информации и коммуникации. С помощью медиа происходит познание культурных, социальных, нравственных, духовных ценностей, норм и установок, расширение у подрастающего поколения представлений об ожидающих его во взрослой жизни социальных ролях. Освоение медиакультуры открывает богатейшие возможности для развития познавательных интересов, расширения кругозора, повышения интеллектуального и общекультурного уровня духовно нравственного становления личности.

**Литература:**


1. *Баженова Л.М. Медиаобразование школьника* (1-4 классы). Пособие для учителя. М.: Изд-во Российской академии образования, 2004.
2. *Бондаренко Е.А. Формирование медиакультуры подростков // Международная научно-практическая конференция. М., 2002*
3. Усов Ю.Н. Информационные технологии в образовании. Учебник для вузов. М., 2013.
4. Челышева И.В. Методика и технология медиобразования. В школе и вузе. Таганрог, 2009.


**Fasiləsiz təhsil sistemində mediamədəniyyətin inkişaf texnologiyası**

**Xülasə**

Məqalə təhsil sahəsində media mədəniyyətinin inkişafı məsələlərinə həsr olunmuşdur. Kütləvi informasiya mədəniyyətinin inkişafı təhsildə bilik səviyyəsinin inkişafına, şaəirdlərin maraqlarının genişləndirilməsinə, insanın mənəvi və intellektual inkişafına, həmçinin ümumi mədəni səviyyənin artırılması üçün ən zəngin imkanlar açır.

**The technology of media culture development in the system of lifelong education**

**Summary**

The article is devoted to the issues of media culture in education. Mastering media culture opens up the richest opportunities for the development of cognitive interests, expansion of a group of interests, increasing the intellectual and general cultural level of the spiritual and moral formation of the individual.

**K.O. Ədilzadə**
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*
Kemaleoktayqizi1994@gmail.com

# TƏHSİLİN İDARƏ OLUNMASI VƏ ONUN PRİNSİPLƏRİ

***Açar sözlər:*** *təhsil, idarəetmə, prinsip.*
***Key words:*** *education, management, principle*
***Ключевые слова:*** *образование, управление, принцип*

Təhsil biz insanlara obyektiv gerçəkliyin səbəbini öyrənmək,inkişaf etmək,bilik və bacarıqlar əldə etmək ümumilikdə düzgün seçimlər etmək üçün çox əhəmiyyətlidir. Müasir təhsil sosial praktikanın mürəkkəb bir forması olub indiki tarixi mərhələdə cəmiyyətin yeniləşdirilməsində və inkişafında qabaqcıl yer tutur. Təhsil bütöv bir sistemdir. Müasir təhsil sistemində təhsilin aşağıdakı rolunu və onun həlledici mahiyyətini əsas götürürlər.

-Təhsil ictimai praktikanın müstəqil forması, idarəetmə mexanizmi, təşkilati struktur və fəaliyyət sistemidir. Başqa sözlə, təhsil bütün sosial sferalarla əlaqəsi olan elə bir infrastrukturdur ki, o ,bir tərəfdən ictimai mühitin bütövlüyünü saxlayır, digər tərəfdənonun inkişafını təmin edir.

-Təhsil cəmiyyətin bütövlükdə, bəşəriyyətin tarixi-mədəni dəyərlərini formalaşdırma və inkişafetdirmə vasitəsidir.

-Təhsil tarixi-mədəni təcrübəni, insanların həyat tərzini və yaşam qaydalarını, onların ümumi həyatının norma və dəyərlərini zaman-zaman qoruyub saxlayır.

-Təhsil zaman və məkan daxilində insan şəxsiyyətinin və mədəniyyətinin formalaşmasında, onun tərbiyəsində, qabiliyyətinin dərinləşməsində həlledici rol oynamış və oynamaqdadır. Hər bir cəmiyyət özünə, öz tələblərinə müvafiq təhsil sistemi qurur. Deməli demokratik, müstəqil Azərbaycanda da cəmiyyətin əsas prinsiplərinə uyğun yeni,müasir tələblərə cavab verən təhsil sistemi qurulmalıdır. Keyfiyyətli təhsil sistemi yaratmaq üçün təhsilin idarə olunması elmi əsaslarla həyata keçirilməlidir. Bu isə təbii ki, həmin sahəni mükəmməl bilən kadrların hazırlanmasını vacib tələb kimi irəli sürür. Azərbaycanda təhsilin idarə olunması üzrə az da olsa kadrlar vardır. Azərbaycan təhsilinin idarə olunmasında onlar fəal şəkildə çalışırlar. Qeyd etmək lazımdır ki, dövlət proqramı üzrə xaricə təhsil almağa göndərilən gənclər arasında bu sahəyə marağın artması gələcək təhsilimizin inkişafı üçün olduqca əhəmiyyətlidir. Hazırda idarəetmə sahəsində ali təhsilli kadrların çatışmazlığı problemi vardır. Universitetlərdə məktəb direktorlarının təkmilləşdirilməsi üzrə aparılan işlər faydalı olsa da, problemi hələ də tam həll edə bilməmişdir. Problemi həll etmək üçün aşağıdakı qeyd etdiyimiz məsələləri diqqətdə saxlamaq lazımdır.

a)Ali təhsilli pedoqoji kadrların hazırlanması prosesində həm də təhsilin idarə olunması üzrə məsələlərin tələbələrə öyrədilməsi zəruridir.

b) Müəllim hazırlığında idarəetmə məsələlərinin öyrədilməsi diqqət mərkəzində olmalıdır.

c)İdarəetməni ancaq ümumtəhsil məktəbləri ilə məhdudlaşdırmaq olmaz.Bu problemi bütövlükdə təhsilin idarə olunmasının gələcək müəllimlərə öyrədilməsi istiqamətində aparmaqla aradan qaldırmaq mümkündür.İdarəetmə bacarıqları ilə fərqlənən menecment təkcə ölkə daxilində keçirilən layihələrdə deyil,dünyanın müxtəlif ölkələrində reallaşan belə tədbirlərin iştirakçısına ,hətta təşkilatçısına çevrilə bilər.Bu isə şəxsi uğurdan başqa Azərbaycanın dünyada tanıdılması,artmaqda olan nüfuzunun daha da möhkəmləndirilməsində böyük rol oynayır.Bunun üçündə hər bir şəxs məşğul olduğu sahəni dərindən bilməlidir.Təhsil birbaşa gələcəyə hesablandığından buraxılan səhvlərin təsiri uzun müddət özünü göstərir.İnkişaf edən dünyada bu təsirlər ciddi şəkildə nəzərə alınmalıdır.İdarəetmə məsələləri üzrə tanınmış tədqiqatçı İ.Qafarovun fikirləri bu baxımdan diqqəti daha çox cəlb edir.O yazır: ”Qloballaşma istər-istəməz milli dəyərlərlə,mentalitetlə,dinlə bağlı olan məsələlərə mənfi təsir göstərir.Kənardan gələn təsirlər missioner təsiri də ola bilər.Din və dövlət,mədəniyyət sahəsində duyulacaq bu missioner təsirlərdən xalqımızı qorumalıyıq.Qloballaşmanın dərəcəsindən asılı olmayaraq,biz öz kökümüzə bağlılığımızı itirməməliyik.Əks halda,qloballaşmanın gətirdiyi neqativ təsirlərin daha böyük fəsadları olacaqdır”.Bu deyilənlərdən belə nəticəyə gəlmək olar ki,idarəetmə dövlət əhəmiyyətli ciddi önəmə malik bir sahədir və sabahın müəllimlərinin bu sahədən xəbərdar olmaları vacibdir.Qeyd etməliyik ki,təhsil sisteminin idarə olunmasında inzibati-amirlik prinsipi üstünlük təşkil edir.Təhsilin idarə olunmasında təhsil menecmentinin rolu böyükdür.Ümumilikdə menecment-təşkilatın sosial idarə olunmasıdır.Bir çox kontekstlərdə “sosial idarəolunma” və “menecment” anlayışları praktik olaraq uyğun gəlir.Menecment – birbaşa şəkildə təsir göstərməni nəzərdə tutan fərdi yanaşma əsasında deyil,rəhbər və tabeçilikdəkilərin birgə fəaliyyətdə hədəflərə effektli şəkildə çatmaqçün komfortlu əməkdaşlıq şəraitinin yaradılması əsasında olan idarədir.İdarəçi –menecer öz fəaliyyətində insanlarla özü arasında qarşılıqlı hörmətə əsaslanır,əmək fəaliyyətində insanlarla münasibəti inam və etibarlılıq əsasında qurur,özünü müvəffəqiyyətə yönləndirərək,digərlərinin də buna müvafiq olması üçün şərait yaradır.Menecer idarəetmədə elmə əsaslandırılmış prinsiplərə istinad etməlidir.Prinsip-fəaliyyətdə rəhbər tutulan başlıca ideyalardır.Qeyd etmək lazımdır ki,prinsiplərin gözlənilməsi qarşıya qoyulmuş məqsədə çatmağı sürətləndirir.Heç bir elmi prinsipə istinad olunmadan həyata keçirilən rəhbərlik gec-tez öz acı nəticəsini verəcək.Təhsilin idarə olunması prinsiplərini, təhsil sistemində rəhbər vəzifədə çalışan işçilərin bilməsi kifayət deyildir.Ali pedoqoji təhsil alan hər bir şəxs bu həqiqəti dərinliyi ilə başa düşməli və həmin prinsipləri öyrənməlidir.Təhsilin idarə olunması prinsipləri,bir qayda olaraq,bütövlükdə məktəbin idarə olunması kontekstində nəzərdən keçirilmiş,bu barədə kitablar məqalələr çap

olunmuşdur.M.Mehdizadənin,M.Quliyevin,V.Strezikozinin,R.Cabbarovun və başqalarının kitablarını,məqalələrini misal göstərmək olar.Təhsil sisteminin idarə olunması təcrübəsini və nəzərdən keçirdiyimiz ədəbiyyatlara istinad edərək təhsilin idarə olunması ilə bağlı aşağıdakı prinsipləri göstəririk:

Kollegiallıqla vahid rəhbərliyin əlaqələndirilməsi.
İdarəetmədə dövlət və ictimai əsasların əlaqələndirilməsi.
İdarəetmədə elmilik ,nəzəriyyə ilə praktikanın qırılmaz qarşılıqlı əlaqəsi.
İdarəetmədə planlılıq.
İdarəetmədə sistemlilik və komplekslik.
İdarəetmədə səmərəliliyə,yekun nəticələrə nail olmaq meyli.
İdarəetmədə mərkəzləşdirmənin və desentralizasiyanın rasional əlaqələndirilməsi.
İdarəetmədə demokratikləşdirmə və humanistləşdirmə.
İdarəetmədə dövlətin təməl prinsiplərinin gözlənilməsi.
Təhsilin idarə olunmasında dövlətçilik maraqlarının və milli dəyərlərin nəzərə alınması.
Dünyda gedən qloballaşmanın və bəşəri dəyərlərin nəzərə alınması.
İdarəetmədə elmilik.
İdarəetmədə aşkarlıq.
Dövlət idarəçiliyinin ictimai idarəçiliklə vəhdəti.

Bu prinsiplər tam dəqiqliklə öyrənilməli və praktikada tətbiq olunmalıdır o zaman təhsil sahəsində istənilən uğura nail olmaq mümkündür.Təhsil sahəsində uğur dövlətimizin gələcək inkişafı və çiçəklənməsi deməkdir.Azərbaycanın müstəqil bir dövlət kimi nüfuzunun günü-gündən möhkəmlənməsi onun hər bir vətəndaşı,o cümlədən ,gənc mütəxəssisləri üçün yeni-yeni imkanlar açır.Ancaq bu imkanlardan səmərəli istifadə etmək məhz mütəxəssisin özündən,təhsil illərində öyrənməyə necə münasibət bəsləməsindən ,peşəsinin əsl ustası olub-olmamasından ,başlıcası isə fəaliyyət göstərəcəyi sahənin idarə edilməsi məsələləri ilə bağlı bilik və bacarıqlarından asılıdır.Ona görə də hesab edirik ki,idarə etmə məsələləri konkret bir müəssisəyə deyil,həyatın bütün sahələrinə aiddir və bunu öyrənmək vacibdir.

**Ədəbiyyat:**

1. Oqtay Abbasov.”Təhsilin idarə olunması”.Bakı 2016
2. Rüfət Hüseynzadə.”Pedoqogika” Bakı 2009.
3. F.Məmmədov.”İdarəetmə mədəniyyəti” Bakı2013.
4.Tofiq Quliyev “Menecmentin (idarəetmənin) əsasları”.Bakı 2006

**Education management and its principles**

**Summary**

Success in education is the future development and prosperity of our state. Strengthening of its reputation as an independent state from day to day opens new opportunities for every citizen, including young specialists. However, the effective use of these opportunities is based on the knowledge and skills of the specialist, how he attaches himself to studying, how he / she is a master of his / her profession, and the field where he / she operates. Therefore, we believe that managing issues relate not to a particular enterprise, but to all aspects of life, and it is important to learn.

**Управление образованием и его принципы**

**Резюме**

Успех в образовании - это будущее развитие и процветание нашего государства. Укрепление своей репутации как независимого государства изо дня в день открывает новые возможности для каждого гражданина, в том числе молодых специалистов. Тем не менее, эффективное использование этих возможностей основано на знаниях и навыках специалиста, как он приучает себя к изучению, как он / она является хозяином своей профессии и той области, где он работает. Поэтому мы считаем, что управление проблемами относится не к конкретному предприятию, а ко всем аспектам жизни, и важно учиться.

$2^{19936}(2^{19937}-1)$

Ədalət (düzgünlük) bildirən ədədlər. Pifaqorçular ədədin özünə hasilini (və ya kvadratını) bərabərliyin və düzgünlüyün simvolu adlandırmışdılar. Eyni zamanda bir qrup ədədlərə də düzgünlük adını onlar vermişdilər. Pifaqorçular bu haqda belə fikir yürütmüşdülər: "K kvadrat ədəd, bərabəri bərabərə vurmaqdır, ona görə də kvadrat ədəd düzgünlüyün simvoludur." Bununla pifaqorçular yeni bir şey kəşf etmiş kimi, ədədlər arasında olan müxtəlif münasibətləri əşyalara, hadisələrə və insanlar arasındakı münasibətlərə köçürmək üstündə xeyli baş sındırmışlar.

Pi ədədi – Xeops piramidasının ölçüləri bu ədədlə əlaqədardır. Maraqlı budur ki, bu ədəddə ilk 100 rəqəmlərin sırasında heç bir təkrar yoxdur.

3,14159265358979323846264338327950288419716939937510

58209749445923078164062862089986280348253421170679

Misir piramidalarındakı qəbirlərdən birinin üzərində "2520" ədədi yazılmışdır. "Niyə məhz bu ədəd" sualına cavab axtarsaq, belə nəticəyə gələ bilərik: bu ədəd 1-dən 10-a qədər bütün ədədlərə qalıqsız bölünür, yəni bu ədəd 1-dən 10-a qədər ədədlərin ƏKOB-dur.

Oğuz mifologiyasına görə, 3 – sınama, indiki, gələcək və keçmiş zaman, 3 ölçülü fəzanı bildirir. 4 qütb, 4 ünsür, fəsillər, 7-həftənin günləri, zərdə 1-6, 2-5, 3-4 qarşıdurması və s.-dir.

Ömər Xəyyam (1048-1131) XII əsrin əvvəllərində Evklidin "Əsaslar" əsərinə şərh verərək və Evdoksun nisbətlərin ümumi nəzəriyyəsini tədqiq edərək ədəd anlayışını nəzəri olaraq həqiqi ədədlərə qədər genişləndirmişdir. Ömər Xəyyamın ideyaları sonralar məşhur azərbaycanlı alimi Məhəmməd Nəsirəddin Tusinin (1201-1274) "Evklidin şərhi" və "Tam dördbucaqlı haqqında traktat" əsərlərində inkişaf etdirilmişdir. Tusinin traktatları beş kitabdan ibarətdir: 1-ci əsər ədəd anlayışının genişlənməsinə həsr edilmiş, hər bir ədədə - rasional və ya irrasional ədədə nisbət kimi baxılmışdır. 2-ci kitab dördbucaqlılar haqqında Menelay teoreminə həsr edilmişdir. Burada teoremin müxtəlif hallar üçün isbatları nəzərdən keçirilir. 3-cü kitab üçbucaqlarda sinislar teoreminə, 4-cü kitab sferik fiqurlara, 5-ci kitab isə sferik triqonometriyaya həsr olunmuşdur. Triqonometriyanın bir elm kimi formalaşması və inkişafı məhz Tusinin adı ilə bağlıdır. Orta məktəbdə triqonometriyanın tədrisinidə Tusi ideyalarnın öyrədilməsi, onun bu elmə verdiyi töhvələrlə şagirdlərin tanış edilməsi gənc nəslin vətənpərvərlik hisslərinin inkişafına güclü təsir edə bilər.

Tusinin əsərləri yalnız XVI əsrin sonunda Romada çap etdirilir və latın dilinə tərcümə olunur. Bu əsərlər XVII əsrdə bir çox Avropa riyaziyyatçılarına çox böyük təsir göstərir. Evklidin paralel xətlər haqqında beşinci postulatının isbatı da Tusinin adı ilə bağlıdır. Belə ki, ilk dəfə olaraq Tusi göstərmişdir ki, kainatda (fəzada) paralel xətlər arasındakı məsafələr çox böyük olduğu halda, onlar kəsişə bilərlər. Bu məsələ ilə sonralar Koşi, Qauss, Bolyayi, Lobaçevski məşğul olmuşlar.

Lobaçevskinin xahişi ilə əslən azərbaycanlı, lakin Rusiyanın vətəndaşı olan Mirzə Kazım bəyin Tusinin əsərlərini rus dilinə tərcümə etməsi nəticəsində rus alimi qeyri-evklid həndəsəsini yaratmışdır.

Nəsirəddin Tusiyə görə dünyanın düzümü 7 sıradan ibarətdir – od, hava, su, torpaq, bitki, heyvan, insan. Oddan hava, su odla havanın, torpaq – od, su və havanın, bitki – od, hava, su və torpağın, heyvan – od, su, hava, torpaq və bitkinin, insan – od, su, torpaq, hava, bitki və heyvanın üzvi vəhdəti nəticəsində yaradılmışdır. Səkkizinci yerdə süni intellekt, doqquzuncu yerdə ölümsüz reallıq dayanmalıdır. Doqquzuncu yerdə dövrə qapanır, bütün səkkiz mövcudat daxilində həyat vardır, elə ki, sıra doqquzu keçdi, maddi ruhun ölümsüzlüyə qovuşması, şüurun yüksək inkişafı nəticəsində telepatiyanın və fikrin sürətli yayılması (ən uzaq məsafəyə bir anda çata bilməsi) baş verir və dövrə qapanandan sonra hər şey sıfırdan başlayır.

Ümumiyyətlə, Tusinin riyazi irsi o qədər zəngin və çoxcəhətlidir ki, bunu təbliğ etmək, şagirdlərə düzgün çatdırmaq və öyrətmək onların mənəviyyatına, dünyagörüşlərinin zənginləşməsinə təsir edər.

Riyaziyyat – dünyanın dərk edilməsi üçün bir alətdir. Təbiətin dili əslində riyazi dildir. Bu dil ciddi riyazi qanunlara tabedir. Qanunlar isə ədədlər vasitəsilə yazılır. Bu səbəbdən ədədləri tanımaq, onları abstrakt deyil, canlı, mifik, həyatla bağlı kimi göstərmək və şagirdə məhz bu cür sevdirmək çox mühümdür.

İbtidai siniflərdə "Vaxtın ölçülməsi" mövzusunun tədrisində şagirdlərə qədim dövrlərdə insanların istifadə etdikləri günəş, qum, su saatları haqqında məlumat vermək, sutkanın, ayın, ilin necə yaranmasını izah etmək lazımdır.

Qraflar nəzəriyyəsinin köməyilə məsələ həlli riyaziyyatda istifadə edilən səmərəli həll metodu kimi qiymətləndirilir. Qraflar nəzəriyyəsi XVIII əsrdə L.Eylerin Köninqberq körpüləri haqqındakı məsələni həll etməsi ilə yaranmışdır. Belə ki, Köninqberqdə çayın iki qolu şəhərin içərisində kiçik bir bir ada yaratmış və çayın bir sahilindən digərinə keçmək üçün yeddi körpü tikilmişdir. Sakinlərdən biri belə bir sual verir – körpülərdən elə keçmək olarmı ki, hər körpüdən yalnız bir dəfə keçəsən və axırda yenə də başlanğıc nöqtəyə qayıdasan. Bu məsələnin həlli həmin dövrün bir çox riyaziyyatçılarını düşündürmüş, nəhayət, qraflar nəzəriyyəsinin köməyilə L.Eyler tərəfindən həll edilmişdir. Bu məsələ hazırda riyaziyyatın çox mühüm bölməsi olan və əsas ideyası kəsilməzlik nəzəriyyəsi olan topologiyanın yaranmasına və inkişaf etməsinə səbəb olmuşdur. L.Eyler göstərmişdir ki, "yeddi körpü məsələsi"nin həlli yoxdur.

Ümumiyyətlə, dərslərdə bu cür tarixi faktlara yer verilməsi şagirdlərin riyaziyyata marağını artıran, onların mənəvi tərbiyəsinə müsbət təsir göstərən, onlarda vətənpərvərlik, humanizm, ədalət kimi keyfiyyətlərin formalaşmasına səbəb olan güclü bir amildir. Ona görə də inkişafetdirici təlimdə bu amilin nəzərə alınması və tətbiq edilməsi məqsədəuyğun olardı.

**Ədəbiyyat:**


1. Əliyev R. Riyazi mifologiya. Bakı, 2008.
2. Məmmədov O.I. Riyaziyyat elminin yaradıcıları haqqında. Bakı: Maarif, 1981.
3. Дорофеев Г.В. О принципах отбора содержания школьного математического образования // Математика в школе. 1990. N 6. с.2-5.
4. Иванова Т.А. Гуманитаризация общего математического образования: Монография. Нижний Новгород: Изд-во НГПУ, 1998. 206 с.
5. Карпаченко Е. Тайны чисел. Математика. / Прил. К газете «Первое сентября» №3, 2007.
6. Кордемский Б.А. Математическая смекалка. М.: Наука, 1991.
7. Мартин Гарнер. Математические досуги. М.: Мир, 1972.


**Исторический материал на уроках математики**


**Резюме**

Большую роль в развитии школьников играет познавательные задания исторического характера. Эффективность развития познавательной активности младших школьников на уроке математики будет выше, если использовать исторический материал. Знакомство с историей науки существенно влияет на более глубокое усвоение основных научных понятий и дает возможность правильно формулировать представления о диалектике процесса познания, закономерности развития математической науки и эмоционально настраивать учащихся на положительное восприятие культурного наследия.


**Usage of historical material at the mathematics lessons**


**Summary**

Educational tasks of a historical nature play a big role in the development of schoolchildren. The effectiveness of the development of cognitive activity of younger schoolchildren in the mathematics lesson will be higher if we use historical material. Acquaintance with the science history significantly influences the deeper assimilation of the basic scientific concepts and makes it possible to correctly formulate ideas about the dialectic of the knowledge process, development patterns of mathematical science and to emotionally tune students to a positive perception of cultural heritage.

**З.Н.Рагимова**
Бакинский славянский университет

# ИЗУЧЕНИЕ ИМЕН СУЩЕСТВИТЕЛЬНЫХ СТУДЕНТАМИ-АЗЕРБАЙДЖАНЦАМИ

***Ключевые слова***: *умение различать, умение писать, умение изменять, падежные окончания.*
***Açar sözlər***: *fərqləndirmək qabiliyyəti, yazma qabiliyyəti, dəyişdirmə qabiliyyəti, halın şəkilçiləri.*
***Keywords***: *the ability to distinguish, the ability to write, the ability to change, case endings.*

**Имя существительное** — это часть речи, которая обозначает предмет, выражает это значение в формах рода, числа и падежа. В лингвистике понятие предметности рассматривается обобщенно. Это названия конкретных предметов *(ваза, стол),* лиц, живых существ *(ученик, девочка),* растений *(берёза, колокольчик),* веществ *(серебро, соль),*географические названия *(Волга, Сочи),* явления природы *(гроза, ветер),* качества и свойства в отвлечении от носителя *(темнота, синева),*состояние *(радость, грусть),* действие в отвлечении от субъекта *(полёт, ходьба).* В начальных классах происходит практическое знакомство учащихся с разнообразием семантики имен существительных.

При изучении данной части речи школьники усваивают важный синтаксический признак существительных — их способность присоединять имена прилагательные и глаголы и сочетаться с ними по способу согласования *(страшный рассказ, вечерняя прогулка* и др.).

***Задачи изучения имени существительного*** сформулированы Т. Г. Рамзаевой. Таковыми являются:

- 1) формирование грамматического понятия "имя существительное";
- 2) овладение умением различать по вопросу одушевленные и неодушевленные имена существительные;
- 3) формирование умения писать с большой буквы фамилии, имена и отчества людей, клички животных, географические названия;
- 4) ознакомление с родом имен существительных, употребление Ь у существительных с шипящими на конце;
- 5) развитие умения изменять имена существительные по числам, распознавать число;
- 6) выработка навыка правописания падежных окончаний имен существительных (кроме существительных па *-ия, -ий, -ие,* а также кроме творительного падежа существительных с основой на шипящие и Ц: *свечой, плащом, огурцом);*
- 7) обогащение словаря новыми именами существительными и развитие навыков употребления их в речи;
- 8) развитие логического мышления учащихся (овладение операциями анализа, сравнения слов, обобщения и др.).

М. Р. Львов выделяет ***ступени работы над понятием "имя существительное".***

*Первая ступень* предполагает первоначальное знакомство школьников с основным семантическим признаком имени существительного — предметностью, имеющей обобщенный и абстрактный характер (например, слова *мороз, краснота, бег* не воспринимаются ребенком как конкретные предметы). Для наблюдения существенных признаков данной части речи рекомендуется использовать конкретный языковой материал. В механизме осознания общего грамматического значения имени существительного значимую роль играют вопросы: сначала вопросы именительного падежа, в дальнейшем — вопросы косвенных падежей. Механизм задавания вопросов расширяется, становится универсальным.

На *второй ступени*осознание учащимися отличительных признаков данной части речи происходит на основе перехода от морфологии к синтактическим отношениям, связям внутри предложения. Умение ставить вопросы к словам требует, как минимум, знакомства с главными членами предложения. Школьники осознают функцию имени существительного в речевой конструкции, передающей мысль говорящего.

*Третья ступень* связана с изучением рода имен существительных.

Па *четвертой ступени* осуществляется ознакомление с изменением формы имени существительного (изменением по числам и падежам).

При ***изучении рода имен существительных*** необходимо учитывать структурно-семантические и грамматические особенности данной категории, которая занимает центральное место в грамматической системе имени существительного. Категория рода является главным средством выражения предметности. В процессе ознакомления с родом школьники осваивают структурно-семантические особенности сочетаний имени существительного с согласуемыми с ним прилагательными и глаголами.

Категорию рода в единственном числе имеют изменяемые и неизменяемые слова. Во множественном числе имена существительные не обладают этой категорией. Собственно морфологическим средством выражения родовых различий являются окончания. Каждый род располагает своей системой окончаний. У младших школьников возникают трудности при распознавании рода существительных по данному признаку, так как в русском языке много слов с безударными окончаниями. Кроме того, у существительных разного рода

могут быть одинаковые окончания. В практике начального обучения род имен существительных определяется с помощью замены имен существительных личными местоимениями *он, она, оно,* путем подстановки притяжательных местоимений *мой, моя, мое.*

Для ознакомления младших школьников с данной грамматической категорией подбираются три имени существительных (например, *пенал, книга, яблоко).* Учащимся предлагается составить мини-текст по вопросам учителя с именем существительным *пенал.* При чтении составленного текста учащиеся обнаруживают в нем ошибку — повторение в каждом предложении одного и того же имени существительного. Детям предлагается отредактировать текст. В процессе редактирования школьники предлагают заменить имя существительное в одном из предложений словом *он.* В результате наблюдения учащиеся делают вывод, что имя существительное *пенал* можно заменить словом *он.* Далее школьникам предлагается речевая ситуация, предполагающая употребление в высказываниях детей притяжательного местоимения *мой:* "Представь, что этот пенал принадлежит тебе. Как ты об этом скажешь? (Пенал мой.)".

Делается обобщение, вводится термин "имя существительное мужского рода". Также происходит знакомство с именами существительными женского и среднего рода.

На начальном этапе работы с категорией рода имен существительных Т. Г. Рамзаева рекомендует в качестве языкового материала использовать слова в именительном падеже. Затем можно предлагать учащимся тексты, в которых существительные употреблены в косвенных падежах. При изучении данной категории целесообразно предлагать для наблюдения имена существительные, распознавание рода которых вызывает у них затруднения *(карамель, тюль, медаль, помидор* и др.).

Для выражения родовых значений в лингвистике выделяются также лексические, словообразовательные и синтаксические средства. Так, категория рода выражена лексически в некоторых названиях людей и животных *(мальчик — девочка, петух — курица).* Словообразовательные средства имеют место лишь в названиях людей и животных *(пианист — пианистка, медведь — медведица, заяц — зайчиха).* К синтаксическим средствам относятся формы согласования *(холодный ветер, холодная погода, холодное утро).* В связи с этим необходимо осуществлять практическое знакомство учащихся и с данными средствами.

***Ознакомление с изменением имен существительных по числам*** происходит с учетом основных признаков данной словоизменительной категории, которая выражается в противопоставлении соотносительных форм единственного и множественного числа, значения единичности (множественности) предметов *(город — города, облако — облака, страна — страны).* Основным средством выражения числа являются окончания.

При изучении этой темы в качестве языкового материала используется имя существительное в форме единственного и множественного числа. Например, *книга — книги.* Учащимся предлагается определить, сколько предметов обозначает существительное *книга.* (Один предмет.) После этого дастся определение понятию "имя существительное единственного числа". Аналогично происходит знакомство с формой множественного числа. В результате учащиеся делают вывод, что имя существительное изменяется по числам.

Далее проводится наблюдение над изменением окончания при изменении имени существительного по числам. Школьникам предлагается выделить окончания имени существительного в единственном и множественном числе и определить, что происходит с окончанием при изменении имени существительного по числам. Дети приходят к выводу, что при изменении имени существительного по числам окончание изменяется.

В русском языке не все имена существительные изменяются по числам. Программой по русскому языку предусмотрено знакомство с именами существительными, которые употребляются только в единственном или во множественном числе *(сахар, ножницы).*

***Ознакомление с понятием "склонение", изучение падежей*** осуществляется с учетом следующих положений. *Падеж* в лингвистике определяется как словоизменительная категория, выражающая отношение обозначаемого существительным предмета к другим предметам, действиям, признакам. Усвоение категории падежа зависит от понимания связи слов в предложении, поэтому работу над падежами следует начинать после того, как учащиеся научатся выделять в предложении слова, связанные но смыслу и грамматически.

При изучении данной грамматической категории школьники получают теоретические сведения о склонении имен существительных, особенностях каждого падежа. Эти знания позволяют учащимся усвоить механизмы включения имей существительных в речевые конструкции — словосочетания, предложения, текст. Кроме того, учащиеся получают теоретическую основу для проверки правописания безударных падежных окончаний.

Для наблюдения используется текст, в ходе анализа которого школьники замечают, что в каждом предложении повторяется одно и то же имя существительное. Детям предлагается установить связь этого имени существительного в каждом предложении с другим словом. Учащиеся последовательно читают предложения, задают вопрос к имени существительному. Так происходит знакомство с падежными вопросами.

Далее проводится наблюдение над изменением имени существительного и его окончаний в сочетании с разными словами, что позволяет учащимся сделать вывод: изменение окончаний существительного по вопросам называется изменением по падежам. Затем осуществляется знакомство школьников с названием каждого падежа, падежными вопросами, дается определение понятия "склонение".

Сознательное употребление имени существительного в определенном падеже предполагает наличие у детей умения отличать один падеж от другого. В процессе изучения падежей школьники усваивают признаки каждого падежа — вопросы, предлоги, окончания, синтаксическую функцию. Вопросы, предлоги и окончания разных падежей могут совпадать, что приводит к возникновению у учащихся трудностей в определении падежа. Поэтому распознавание падежей должно производиться по совокупности признаков.

Падежные вопросы при определении значения падежей играют второстепенную роль, но их использование на основе языковой интуиции безошибочно. Т. Г. Рамзаева отмечает, что при формировании умения использовать вопросы для распознавания падежей необходимо обеспечить знание учащимися падежных вопросов, владение умением задавать вопрос к существительному от того слова, к которому оно относится. С этой целью рекомендуется сравнивать вопросы всех падежей, выделять сходные вопросы, а также вопросы, свойственные только одному падежу. В процессе наблюдения над падежными вопросами следует обращать внимание учащихся и на смысловые вопросы. Так, например, вопрос "Где?" нельзя использовать для распознавания падежей, так как на этот вопрос отвечают родительный, дательный, творительный и предложный падежи.

Показателем падежной формы слова в предложении является также предлог. В связи с этим в процессе изучения падежей необходима специальная работа над предлогами. Результаты наблюдений над употреблением предлогов с определенным падежом рекомендуется обобщать в виде таблицы "Падежи и предлоги". Т. Г. Рамзаева считает, что предлоги целесообразно в таблице помещать перед вопросами, так как в речевой практике они всегда предшествуют существительному, отвечающему на тот или иной вопрос.

С целью повышения эффективности формирования умения определять падеж имени существительного учащиеся должны овладеть следующей последовательностью действий:

1) установить связь слов в предложении и найти то слово, от которого зависит имя существительное;

2) по вопросу и предлогу определить падеж.

Сложным для усвоения является теоретический материал о *типах склонения* имен существительных. Т. Г. Рамзаева считает, что для активизации познавательной деятельности учащихся и более прочного усвоения данного материала необходимо так организовать процесс изучения типов склонения существительных, чтобы учащиеся самостоятельно выявили признаки, по которым имена существительные делятся на три склонения.

Аналогично проводится работа над именами существительными мужского рода с нулевым окончанием и среднего рода с окончаниями -о, *-е,* а также над существительными женского рода с нулевым окончанием (с мягким знаком на конце). Далее школьникам предлагается сравнить окончания всех существительных в каждом падеже. В процессе сравнения дети приходят к выводу о том, что все имена существительные можно разделить на три группы, так как каждая группа существительных в каждом падеже имеет одинаковые окончания. Таким образом, наблюдение над окончаниями имен существительных позволяет учащимся осознать, по какому признаку в русском языке выделяются имена существительные 1, 2, и 3 склонения. После этого школьники определяют признаки имен существительных каждой группы (род и окончания). Достоинство исследовательского подхода заключается в том, что склонение существительных предстает как система.

Догматический подход предполагает последовательное ознакомление с именами существительными трех склонений. Заметим, наблюдение над склонением каждой группы имен существительных тоже включает элементы исследования.

Для усвоения детьми типов склонения существительных рекомендуется использовать грамматический разбор, который требует доказательства принадлежности имени существительного к тому или иному типу склонения (например, имя существительное *дорога* склонения, так как оно женского рода и имеет окончание -*а).*

На основе умений распознавать падежи и типы склонения имен существительных происходит формирование навыка правописания падежных окончаний. Для эффективного использования грамматических знаний при решении орфографических задач Т. Г. Рамзаева рекомендует соблюдать следующую последовательность действий:

1) задать вопрос к существительному от слова, с которым оно связано в предложении;

2) но вопросу и предлогу определить падеж существительного;

3) определить склонение имени существительного

Упражнение 1.

***Прочитайте текст и выполните задания.***

*С давних времен людям, говорящим на разных языках, приходилось общаться друг с другом.*

*Собеседники могут говорить каждый на своем родном языке и частично понимать друг друга, если языки похожи. В славянских странах русского скорее всего как-то поймут, но в соседней Венгрии — уже нет: венгерский язык совершенно не похож на русский.*

*Часто бывает так, что двум собеседникам помогает понять друг друга третий — переводчик. Но, во-первых, на перевод уходит лишнее время, во-вторых, он не всегда возможен.*

*Нередко собеседники переходят на третий язык, не родной для них обоих. В современном мире это может быть абсолютно «ничей» язык эсперанто или латынь, но чаще говорят на языке, который для кого-то*

*в мире родной. Обычно этот язык обладает б?льшим авторитетом, чем родные языки собеседников. Им может быть просто какой-нибудь распространенный язык. В современном мире языком международного общения нередко выступает английский язык.*

(По материалам энциклопедии «Русский язык»)

1.Выпишите из текста имена собственные.

2.Приведите примеры одушевленных и неодушевленных существительных.

3.Выпишите по 2-3 примера существительных 1, 2 и 3-го склонения. Определите их род.

4.Есть ли в тексте разносклоняемые существительные? Выпишите их.

5.Найдите в тексте несклоняемые существительные. Определите их род.

6.Докажите, что слово *русский* в данном тексте используется в значении прилагательного и существительного. Приведите примеры.

7.Найдите в тексте существительные, которые не изменяются по числам. Определите их род.

8.Сделайте морфологический разбор указанных слов.

Упражнение 2.

**В каком ряду все слова являются именами существительными?**

А) растение, трое, возгорание, поле

Б) каре, тире, варьете, вместе

В) натрий, карий, алюминий, всякий

Г) манго, облако, древко, повидло

Упражнение 3.

**В каком ряду все существительные являются неодушевленными?**

А) буйвол, воробей, зверь

Б) народ, труп, студенчество

В) робот, покойник, туз

Г) черт, эгоист, леший

Упражнение 4.

**В каком случае грамматические признаки существительных указаны правильно?**

А) зрение — существительное, нарицательное, неодушевленное, среднего рода, 2-го склонения

Б) росток — существительное, нарицательное, одушевленное, мужского рода, 2-го склонения

В невежда — существительное, нарицательное, одушевленное, женского рода, 1-го склонения

Г) человек — существительное, нарицательное, одушевленное, общего рода, 2-го склонения

Упражнение 5.

**У какого из выделенных в предложении существительных неправильно определены грамматические признаки: Он *рощи*полюбил густые, *уединенье*, тишину, и *ночь*, и *звезды*, и луну?**

А) рощи — существительное, нарицательное, неодушевленное, женского рода, 1-го склонения, употреблено в винительном падеже, во множественном числе

Б) уединенье — существительное, нарицательное, неодушевленное, среднего рода, 3-го склонения, употреблено в винительном падеже, в единственном числе

В) ночь — существительное, нарицательное, неодушевленное, женского рода, 3-го склонения, употреблено в винительном падеже, в единственном числе

Г) звезды — существительное, нарицательное, неодушевленное, женского рода, 1-го склонения, употреблено в винительном падеже, во множественном числе

**Литература:**

1. Виноградов В. В. Русский язык (грамматическое учение о слове) / Под ред. Г. А. Золотовой. - 4-е изд. - М.: Рус. яз., 2001. - 720 с.
2. Антонова Е. С. Методика преподавания русского языка. Коммуникативно - деятельностный подход. - М.: КноРус, 2007. - 464 с.
3. Валгина Н.С., Светлышева Н.В. Русский язык. Орфография и пунктуация. Правила и упражнения - 2-е изд. испр. - М.: Неолит. Большая медведица, 2002. - 416с.
4. Львов М.Р. Основы теории речи: Учеб. Пособие для студ. высш. пед. учеб. заведений. - М.: Издательский центр “Академия”, 2002.-248с.

**Azərbaycan tələbələrinə ismin öyrədilməsi**
**Xülasə**

İsim tədris olunan ilk nitq hissəsidir. Tələbələrə isim öyrədilərkən onların orta məktəbdə bu nitq hissəsi haqqında alınan məlumatları təkrar edilməlidir.

Müəllim ismin tədrisinə sadecə tərifdən başlamalı, induktiv yolla gedərək ayrı-ayrı misallardan, sözlərdən nəticə çıxarmağa doğru hərəkət etməlidir. Belə olduqda tələbə mövzunu mexaniki sürətdə yox, şüurlu olaraq dərk edər. Müəllim qeyd edər ki, isimlər Azərbaycan dilində istənilən gədərdir. Tələbələr isim haqqında mənimsədikləri bütün bilikləri öz nitqlərində tətbiq edə bilməyi bacarmalıdırlar.

İsmin öyrədilməsi ilə bağlı üslubiyyət üzrə də işlər aparmaq müsbət nəticə verər. Müvafiq yaradıcı yazı işlərindən də istifadə etmək məqsədəuyğundur.

**Teaching a noun to Azerbaijani students**
**Summary**

The noun is part of the first speech that is taught. When teaching a noun to the students, they should revise the information. They have been given in this secondary part of the school.

Teacher’s teaching should begin with a simple definition. In this case, the student does not understand the topic mechanically but consciously.

In our day-to-day life, nouns are very common, our poets and writers are widely used in artistic works all features of the noun should be explained separately in each of its categories. Students should be able to apply all their knowledge of the name to their own vocabualary.

**Ş. Agakişiyeva**
Bakı Slavyan Universiteti

## ANA DİLİ KURİKULUMLARINDA DİL QAYDALARININ ÖYRƏDİLMƏSİ

Ana dili kurikulumlarında dil qaydalarının öyrədilməsi probleminə çox geniş yer verilsə də, bu məsələ ilə bağlı nəzərdə tutulanları konkret şəkildə aşağıdakı kimi ümumiləşdirmək olar: şagird dil qaydalarının mənimsədilməsi zəminində "zəruri fonetik, leksik, qrammatik anlayışları izah edir, onları bir-birindən fərqləndirir, mülahizələrini müxtəlif üsullarla əsaslandırır və təqdim edir, şifahi və yazılı nitqində dilə aid qaydaları mənimsədiyini nümayiş etdirir [5, 15].

Dil qaydalarının yeri və əhəmiyyəti ana dili kurikulumlarının məzmun xətləri içərisində xüsusi olaraq qeyd olunur. Dil qaydalarının öyrədilməsi işi ibtidai sinif şagirdlərinin əsas fəaliyyət istiqamətlərindən biri kimi qiymətləndirilir. Şagirdlər dil qaydalarını mənimsəyərkən aşağıdakı keyfiyyətlərə yiyələnirlər:

- Dilin fonetik, leksik və qrammatik quruluşu ilə bağlı minimum bilikləri yığcam, sadə, aydın qayda və şərhlər formasında mənimsəyir;
- Orfoqrafiya və orfoepiya qaydalarına dair zəruri vərdişlərə yiyələnir;
- Durğu işarələrinin əhəmiyyəti, ondan düzgün istifadə olunması zərurətini dərk edir;
- Mədən nitq üçün vacib olan ntq bacarıqları formalaşdırılır;
- Bütün bunların təcrübədə tətbiqinə nail olunur.

İbtidai siniflər üçün fənn kurikulumlarında ana dili təlimində dil qaydalarının öyrədilməsindən əldə edilən təlim nəticələri həm ümumi, həm də hər bir sinif üzrə ayrıca müəyyənləşdirilmişdir. Ümum təlim nəticələri aşağıdakılar nəzərə tutulmuşdur:

*Şagird:*

- Yaş həddinə uyğun zəruri fonetik, leksik, qrammatik biliklərə yiyələndiyini nümayiş etdirir;
- Seçdiyi dil faktlarını qruplaşdıraraq təqdim edir;
- Dinlədiyi fikri anladığını nümayiş etdirir;
- Şifahi nitq bacarıqlarına malik olduğunu nümayiş etdirir;
- Qarşılaşdığı sözlərin mənasını başa düşdüyünü nümayiş etdirir;
- Oxu mexankasına və vərdişlərinə yiyələndiyini nümayiş etdirir;
- Yazı texnikasına və vərdişlərinə yiyələndiyini nümayiş etdirir;
- Kalliqrafiya və orfoqrafiya qaydalarını gözləməklə müxtəlif növ yazılı çalışmalarını yerinə yetirir;
- Fonetik, leksik, morfoloji, sintaktik, orfoqrafik qaydaları mənimsədiyini nümayiş etdirir [6, 20].

Siniflər üzrə problemin quruluşu fərqlənir. Hər sinifin özünəməxsus öyrənilən problemləri, tələbləri vardır. Bu "zəruri dil qaydalarını mənimsədiyini nümayiş etdirir" adlı ümumi bir müddəa müxtəlif etaplara bölünür, siniflər üzrə öyrədilməsi nəzərdə tutulan dil qaydaları konkret məzmun standartları şəklində qərarlaşır. Bunlar aşağıdakılardan ibarətdir:

**I sinifdə şagird ana dili təliminin tədrisi nəticəsində:**

1. Səs və hərfləri adıandırır və onları fərqləndirir;
2. Sait və samit səsləri tanıyır;
3. Sait səslərə görə sözləri hecalara ayırır;
4. Böyük və kiçik hərfləri fərqləndirir;
5. Hərfləri əlifba sırası ilə sadalayır;
6. Tək və cəm anlayışlarını nümunələrlə izah edir;
7. Ad, əlamət və hərəkət bildirən sözləri tanıyır və fərqləndirir;
8. Cümləni tanıyır və əsas əlamətlərini sadalayır;
9. Məqsəd və intonasiyaya görə cümlələri fərqləndirir [7, 22].

I sinifdə ana dili təliminin başlanğıc mərhələsidir və bu mərhələ ana dili təliminə giriş xarakteri daşıyır. Biz bunu əyani olaraq yuxarıda qeyd olunan maddələrə nəzər salaraq da aydın şəkildə görə bilərik. Bir sözlə I sinifdə öyrədilən "dil qaydaları" şərti xarakter daşıyır. Burada öyrədilənlər yuxarı siniflərdə öyrədilən dil qaydalarına zəmin yaradır. I sinifdə ana dli təlimi gedişatında fonetika, morfologiya və sintaksis haqqında elmi biliklərə hazırlıq işləri aparılır. Şagirdlər birinci sinifdə səsi hərfdən, saiti samitdən fərqləndirməyi, sözdə saitlərin sayı qədər hecaların olmasını, sözlərin kəmiyyətcə tək və cəm formada olmasını, müxtəlif qrammatik məna qruplarına aid olmağını dərk edərək öyrənir. Cümlə nədir anlayışı ilə tanış olur, sözü cümlədən fərqləndrməyi bacarır. Sözlər cümlənin fərqini müəyyənləşdirmək üçün tapşırıqlar üzərində müxtəlif formalarda müşahidələr aparır. Qeyd olunan bu məsələ dil vahidlərinn öyrədilməsidir və şagirdin fikrinin ifadəs üçün vacib hesab olunanlardandır. Tapşırıqlar daha çox praktik olaraq yerinə yetirilir.

I sinifdə yuxarıda qeyd olunan maddələr üzrə şagird biliklədirildikdən sonra növbəti tədris ilində - II sinifdə artıq maddələrin məzmununda daha irəli gedərək inkişaf müşahidə olunur. Daha geniş çərçivədə dil qaydaları şagirdlərə öyrədilir. Müxtəlif dilçiliyə aid olan anlayışlar, terminlər tədrisə yol açır. Lakin əsas məsələ anlayışlar, terminlər şagirdlərin anlayacağı formada şagirdlərə çatdırılır, onlarda bilik və təsəvvürlər formalaşdırılır. II sinifdə şagirdlər aşağıdakı dil qaydalarına yiyələnirlər:

**Şagird II sinfin sonunda:**

1. Sait və samit səsləri fərqləndirir;
2. Sözlərin böyük hərflə yazılışına dair qaydalardan məqamına uyğun istifadə edir;
3. Rast gəldiyi yeni sözlərin yazılış və tələffüz qaydalarını müəyyənləşdirmək üçün lüğətdən istifadə edir;
4. Cəm şəkilçisinin düzgün yazılış və tələffüz variantlarını fərqləndirir;
5. Sözləri qrammatik mənasına görə qruplaşdırır;
6. Cümləni digər nitq vahidlərindən fərqləndirir;
7. Tələb olunan məqsəd və intonasiyaya görə cümlə qurur və müvafiq işarələrlə tamamlayır [7, 24].

Birinci sinifdə şagird sadəcə sait samiti tanıyırdısa, ikinci sinifdə bununla kifayətlənməməli, sait samiti sözlər daxilində bir-birindən fərqləndirməyi bacarmalıdır. Həmçinin böyük hərflə yazılan sözlərin niyə böyük hərflə yazıldığını məntiqi formada düşünməyi bacarmalıdır. Lüğətdən istifadə edərək sözlərin yazılış və deyiliş qaydaları üzərində iş aparmalıdır. Cəm şəkilçisi olan –lar, -lər, həmişə yazıldığı kimi deyil, bəzi hallarda fərqli formalarda tələffüz edildiyini, sözlərin qrammatik məna növlərini uyğun terminlərlə yadda saxlamalı, məqsəd və intonasiyaya görə cümlənin növləri (nəqli, əmr, sual) barədə ilkin məlumatlara sahib olmalı, cümlənin sonunda hansı durğu işarələrnin (nöqtə, nida, sual) istifadə olunacağını müəyyən etməyi dərk etməlidir.

III sinif dərsliklərində daha dərin formada dil qaydalarına toxunulur. Sait və samitləri öyrənən şagirdlərə artıq onların növləri haqqında biliklər verilir, böyük hərflə yazıla biləcək söz qrupları geniş tərkibdə öyrədilir, sözlərin yazılış, deyiliş qaydaları üzrə iş aparılır. Sözlər konkret nitq hissələrə aid olaraq öyrədilir. Nitq hissələri əvvəlki siniflərdən fərqli olaraq xüsusi terminlərlə ifadə olunmağa başlayır, terminlərlə adlandırılaraq fərqləndirilir. Cümlə üzvlərinin baş və ikinci dərəcəli üzv olmaqla cümlənin qurulmasında rolu müəyyən edilir. Buna uyğun olaraq yekun nəticə kimi III sinfə dair ana dili kurikulumlarında şagirdlərin aşağıdakı zəruri dil qaydalarını mənimsəmələrini nəzərdə tutulur:

**III sinfində şagird:**

1. Sait və samit səsləri növlərinə görə izah edir;
2. Sözlərin böyük hərflə yazılışına dair qaydalardan məqamına uyğun istifadə edir;
3. Rast gəldiyi yeni sözlərin yazılış və tələffüz qaydalarını müəyyənləşdirmək üçün lüğət və sorğu kitablarından istifadə edir;
4. Cəm şəkilçisinin yazılışı və tələffüzü ilə bağlı qaydaları nitqində tətbiq edir;
5. Leksik və qrammatik mənalarına görə sözləri adlandırır və fərqləndirir;
6. Cümlənin formalaşmasında baş və ikinci dərəcəli üzvlərin rolunu sadə şəkildə izah edir;
7. Məqsəd və intonasiyanı dəyişməklə verilmiş cüməni müxtəlif məqamlarda işlədir [7, 26].

İbtidai təhsilin yekunu olaraq IV sinifdə əvvəlki illərdə öyrənilən ana dili üzrə dil qaydaları yekunlaşdırılır, dəqiqləşdirilir və daha da möhkəməndirilir. Əvvəldə qeyd olunanlarla yanaşı dördüncü sinifdə əsas nitq hissələri ilə yanaşı köməkçi nitq hissələri haqqında da ilkin məlumat şagirdlərə verilir. Cümlə üzvləri, cümləyə dair biliklər kifayət qədər ətraflı şəkildə genişlənir, şagirdlərin sözdən istifadə və cümlə qurmaq vərdişləri inkişaf etdirilir, əməli yazılar üzrə praktik tapşırıqlar şagirdlərlə birgə həyata keçirilir. Bütün bunları nəzərə alaraq IV sinfin ana dili üzrə fənn kurikulumunda dil qaydalarının mənimsədilməsinin aşağıdakı sistemi tövsiyə edilmişdir.

**IV sinfin sonunda şagird:**

1. Sadə formada fonetik təhlil aparır;
2. Sözlərin böyük hərflə yazılışına dair qaydalardan məqamına uyğun istifadə edir;
3. Rast gəldiyi yeni sözlərin yazılış və tələffüz qaydalarını müəyyənləşdirmək üçün lüğət, sorğu kitabları və kataloqlardan istifadə edir;
4. Cümlənin formalaşdırılmasında cəm şəkilçilərindən düzgün istifadə edir;
5. Köməkçi nitq hissələrini tanıyır, onların əsas nitq hissələrindən fərqini izah edir;
6. Cümlənin düzgün qurulmasında baş və ikinci dərəcəli üzvlərin yerini dəqiq müəyyən edir;
7. Cümlə və onun növləri ilə əlaqədar kiçik təqdimatlar edir [7, 28].

Dil qaydalarınınn mənimsədilməsi ilə bağlı sadalanan bacarıqlarla yanaşı ana dili kurikulumlarında şagirdlərdə bir sıra ümumi bacarıqların da formalaşdırılması nəzərdə tutulmuşdur:

- Araşdırma, təhliletmə bacarığı;
- Tədqiqatçılıq bacarığı;
- Tənqidi düşünə bilmək bacarığı;
- Yaradıcı düşünmək bacarığı;
- Təşəbbüskarlıq bacarığı;
- İnformasiya texnologiyalarından istifadə etmək bacarığı;
- Ünsiyyət, əməkdaşlıq bacarığı və s.

**Ədəbiyyat:**

1. Abbasov Ə.M. Müasir dərsliklər; xüsusiyyətlər, tələblər, Kurikulum jurnalı, 2011, N 4, 14-21 s.
2. Abdullayev A.S., Kərimov Y.Ş. İbtidai siniflərdə ana dilinin tədrisi metodakiası. Bakı, Maarif, 1968, 316 s.
3. Azərbaycan dili – 1 (Tərtibçilər: R.İsmayılov, S.Abdullayeva və b). Bakı, Altun kitab, 2012, 159 s.
4. Azərbaycan dili – 2 (Tərtibçilər: R.İsmayılov, G.Orucova və b). Bakı, Altun kitab, 2009, 208 s.

5. Azərbaycan dili – 3 (Tərtibçilər: R.İsmayılov, G.Orucova və b). Bakı, Altun kitab, 2010, 208 s.
6. Azərbaycan dili – 4 (Tərtibçilər: R.İsmayılov, S.Abdullayeva və b). Bakı, Altun kitab, 2011, 224 s.
7. Əhmədov A., Abbasov Ə. Ümumtəhsil məktəblərində I-IV siniflər üçün fənn kurikulumları. Bakı, Təhsil, 2008, 480 s.

**Teaching language rules in native language curriculum**

**Summary**

The problem of teaching language rules in native language curriculum is widely spread.The place and importance of language rules are specifically mentioned in the content lines of the native language curriculum. Teaching language rules to primary school pupils is assessed as one of the main activities. In addition to specific skills necessary for mastering language rules, it is intended to develop a range of common skills in pupils within native language curriculum.

**Изучение языковых норм в курикулумах родного языка**

**Резюме**

В курикулумах родного языка широкое место отводится проблемам изучения языковых норм. Место и значение норм языка в куррикулумах особо выделяеться. Поэтому этот процесс начинается еще в начальных классах. При этом важно обучать как общим. Так и частным правилам языковых норм

**V.S.Bağırova**
Azərbaycan Dillər Universiteti

# İNGİLİS DİLİNİ XARİCİ DİL KİMİ ÖYRƏNƏN TƏLƏBƏLƏRDƏ OXUDA QARŞIYA ÇIXAN MANEƏLƏRIN ARADAN QALDIRILMASI

***Açar sözlər***: *dəyişikliklər, məqsəd, təlim prosesi, uğurlu*
***Key words***: *changes, goal, teaching-learning process, successful*
***Ключевые слова***: *изменения, цель, учебный процесс, успешный*

Müasir dövrdə xarici dilləri, o cümlədən ingilis dilini tədris edən müəllimlərin əksəriyyəti dilin tədrisi metodikasına dəyişikliklərin gətrilməsini qarşılarında bir məqsəd kimi qoyurlar. İnnovator-müəllimlər ingilis dilinin tədrisi prosesini daha maraqlı, daha asan etməklə tələbələrdə motivasiya yaratmaq və təlim prosesinin daha səmərəli, daha uğurlu olmasının arzusundadırlar. Buna nail olmaq üçün bütövlükdə təlim prosesini, o cümlədən oxunun təlimi prosesini tələbə-yönümlü şəkildə təşkil etmək, tələbələri aktivləşdirmək, onların təlim prosesində fəal iştirakçı qismində iştirakını təmin etmək lazımdır.

Metodist-alimlərin fikrincə, təlim prosesinə innovasiyaların tətbiq edilməsi radikal şəkildə deyil, tədricən, sistemli, mərhələli şəkildə həyata keçrilməlidir[2;3]. Tətbiq edilən yeniliklərin tələbələrin dil sahəsində olan bilikləri və onların nitq bacarıqlarının inkişaf etdirilməsinə və onlarda dilin öyrədilməsinə olan motivasiya səviyyəsinin artırılmasına müsbət təsiri olarsa, yeni ideaların tətbiqi prosesini davam etdirmək məqsədəuyğundur. Dili tədris edən müəllimlərin təcrübəli olub-olmamasından asılı olmayaraq, onlar (EFL) ingilis dilini xarici dil kimi təlim edilməsi prosesini daha səmərəli təşkil etmək və tələbələrdə dilin mənimsənilməsi prosesini daha uğurlu etmək məqsədilə yeni ideya və fəaliyyət növlərini təlim prosesinə ardıcıl şəkildə tətbiq etməlidir. Lakin onu da vurğulamaq lazımdır ki, yenilikləri tətbiq edərkən təlim kontekstinin xüsusiyyətlərini nəzərə almaq olduqca vacibdir. Onu da qeyd etmək lazımdır ki, ingilis dilinin öyrədib-öyrənilməsinin yeganə bir yolu mövcud deyil[3]. Dünya miqyasında ingilis dilini öyrənən insanlar bu dili fərqli məqsədlərlə, müxtəlif üsullarla və müxtəlif təlim şəraitində öyrənir. Dilin öyrədilməsi üsulları, eləcə də öyrənmə strategiyaları da müxtəlifdir. Müxtəlif təlim konteksləri̇ndə dili öyrənən şəxslərin tələbat və ehtiyacları da müxtəlifdir. Belə ki, tələbələrin əksəriyyəti səhv etməkdən qorxur və bu səbəbdən danışmaqdan çəkinirlər, digərləri isə nitqlərinin qrammatik cəhətdən düzgün olub olmamasına diqqət yetirmədən ingilis dilindən belə bir imkan olanda, həm sinifdə, həm də sinifdənkənar şəraitdə istifadə etməyə cəhd edirlər.

Tələbələrin bəziləri auditoriya şəraitində danışmaqdan çəkinir, bəziləri isə qrammatikanın öyrədilməsini üstün tuturlar. Lakin təlim kontekstindən asılı olmayaraq, tələbələrə danışıq, eşidib-anlama, oxu və yazı vərdişlərinin aşılanması zəruridir. Qloballaşan dünyada ingilis dilinin rolu və əhəmiyyətni, eləcə də müasir dövrün tələblərini nəzərə alaraq, yuxarıda qeyd edilən nitq fəaliyyəti növlərinin tələbələrə aşılanması kommunikativ-yönümlü şəkildə həyata keçrilməlidir. İngilis dilində oxunun tədrisinə gəldikdə, sözü gedən fəaliyyət növünün təcrid edilmiş şəkildə tələbələrə aşılanmasının qeyri-mümkün olduğu qeyd edilməlidir. Belə ki, oxu və eşidib- anlamanı birləşdirən xüsusiyyətlər mövcuddur. Bu fəaliyyət növlərini bir-birinə oxşar edən xüsusiyyətlər onların hər ikisini reseptiv fəaliyyət növləri adlandırmaq üçün əsas verir.

Eyni zamanda oxuya xas olan bəzi xüsusiyyətlər bu fəaliyyət növünü yazı fəaliyyət növü ilə müqayisə etmək, və oxu və yazı arasında oxşarlığın olduğu haqqında danışmağa imkan verir. Hər iki proses baş verərkən tələbələrə oxuduqları və yaxud yazdıqları barədə düşünməyə imkan verilir. Belə ki, tələbələr, ehtiyac duyularsa mətni bir daha oxuya bilər yazı vərdişlərinin tələbələrə aşılanmasından danışarkən, burada da, ehtiyac duyularsa, səhvlərin düzəldilməsi, və mətnin yenidən yazılması mümkündür.

İngilis dilini xarici dil kimi öyrənən tələbələr bu və ya digər mətni oxuyarkən adətən hər bir sözü başa düşməyə çalışırlar. Lakin biz ana dilində hər hansı mətni oxuyarkən heç də mətndə olan bütün sözlərin mənalarını başa düşməyə çalışmırıq. Oxu bacarığı onu təşkil edən ayrı-ayrı komponentlərdən ibarətdir. Hər hansı xarici dildə, o cümlədən ingilis dilində oxu bacarıqlarını tələbələrə aşılayarkən ilk növbədə onlarda həmin bacarığının komponentləri olan vərdişləri inkişaf etdirmək lazımdır. Onlar aşağıdakılardır:

1. Qabaqcadan duyma
2. Mətnin əsas ideyasını başa düşmək məqsədilə oxu
3. Mətnin hər hansı xüsusi məlumatın əldə edilməsi məqsədilə oxumaq

İxtisas fakültələrində təhsil alan tələbələrin xarici dildə oxu vərdişlərini inkişaf etdirmək məqsədilə oxu dərsi üç hissədən ibarət olmalıdır.

1. Mətnlə tanışdıqdan əvvəl yerinə yetirilən tapşırıqlar
2. Oxu prosesində həyata keçirilən fəaliiyət növləri
3. Oxu başa çatdıqdan sonra yerinə yetirilən tapşırıqlar

Oxudan əvvəl yerinə yetirilən fəaliyyət növləri məqsədyönlü və qısa müddətli olmalıdır. Həmin fəaliyyət növlərinin yerinə yetrilməsinə 5-10 dəqiqədən artıq vaxtı ayrılmamalıdır. Dərsin bu mərhələsində tələbələrə oxu üçün təqdim edilmiş mətnin başlığı haqqında məlumat verilir və onlara mətndə istifadə edilən söz və sözbirləşmələri, eləcə də ifadələrin siyahısını tərtib etmək, və həmin söz və ifadələri lövhədə yazmağa təklif edilir. Bu yolla həmin sözlərin səmərəli şəkildə mənimsənilməsi və yadda saxlanılması təmin edilir. Həmçinin tələbələrə mətnə dair hər hansı şəkil və

yaxud illüstrasiya eləcə də mətnin başlığı ilə bağlı müzakirələrdə iştirak etmək və nəticə etibarilə bir orta məxrəcə gəlmək təklif edilə bilər. Metodist alimlər mətnə aid olan əsas mənanı daşıyan və tələbələr üçün çətinlik törədə bilən açar sözlərin əvvəlcədən tələbələrə təqdim edilməsini tövsiyyə edirlər[1;3]. Bilavasitə oxu prosesinə gəldikdə, tələbələrə həm ucadan oxu, həm də sakit oxu vərdişlərinin aşılanması eyni dərəcədə vacibdir. Onu da qeyd etmək lazımdır ki, tələbələrə bu və ya digər mətnin oxunulması tapşırıqlarında, onlara vaxt baxımından məhdudiyyət qoyulmalıdır. Bu yolla onlar daha surətlə oxumaq və yalnız açar sözlərin mənalarını tapmağa yönəldilir.

Oxu təlimi prosesinin real həyat şəraitində mümkün dərəcədə bənzətmək üçün tələbələri daha çox fərdi şəkildə işləməsinə və sakit oxuya üstünlük verilməlidir.

Tələbələrə xarici dildə oxu vərdişlərini aşılayarkın aşağdakıları nəzərə almaq lazımdır.

- Ucadan oxu əslində oxu vərdişlərindən daha çox tələffüz vərdişlərinin inkişaf etdirilməsinə xidmət edir.
- Poem və pyeslər ucadan oxunulmalı və bu zaman məhz bu üsullardan istifadə etmək daha düzgün və təbiidir.
- Ucadan oxu səlisliyin inkişaf etdirilməsi üçün səmərəli şəkildə istifadə edilə bilən bir üsuldur.

Oxu zamanı yerinə yetrilməsi tövsiyə edilə bilən tapşırıqlar siyahısına aşağdakılar daxil edilə bilər.

- Açar sözlərin və əsas məna daşıyan cümlələrin müəyyənləşdirilməsi
- Mətni əsas ideyanı başa düşmək məqsədilə oxunulması.
- Mətni hər hansı xüsusi məlumatı əldə etmək məqsədilə oxunulması
- Suallara cavab
- Naməlum leksik vahidlərin mənalarının kontekst vasitəsilə tapılması

Oxudan sonra yerinə yetirilən tapşırıqlardan danışarkən burada aşağıdakı tapşırıqların yerinə yetirilməsi tövsiyə edilir

- Mətni öz sözləri ilə danışmaq
- Mətnin məzmunu ilə bağlı olan ayrı-ayrı problem məsələlərin cütlük və qrup şəklində müzakirə edilməsi.

**Ədəbiyyat**

1.Besse H. The Pedagogic Authenticity. Quarterly 9, 41-51.
2.Widowson, H. G. 1989. “Knowledge of Language and Ability for Use”, Applied Linguistics, 10, 2, 128-37.
3.Гусейнзаде Г.Д. Обучение речевой коммуникации на иностранном языке. Баку, «Мутарджим», 2001, 314 с.
4. Tannen D. ”Oral and Literate strategies in Spoken and Written Narrative”, Language, 58, 1, 1-21, 1982
5. Widdowson H.G. “The Roles of Teacher and Learner”, ELT Journal, 41, 2, 1987, 83-8

**Eliminating obstacles in reading in students, who learn English as a foreign language**
**Summary**

The article deals with the problem of improving language students’ reading skills. The teachers who want to introduce changes into the system of language teaching should take into account the context in which they teach. Changes should be introduced gradually. The new ideas should be appropriate for the teaching- learning environment and meet the learners needs.

**Устранение сложностей, возникающих у студентов, изучающих английский язык как иностранный**
**Резюме**

Статья посвящена исследованию проблемы развития навыков чтения у студентов языкового вуза. Учителя, которые намереваются вносить изменения в существующую систему преподавания языков, должны учитывать контекст, в котором происходит процесс обучения. Изменения должны внедряться постепенно. Новые идеи должны соответствовать контексту, в котором происходит обучение, а также потребностям обучаемых.

**A.H.Abdullayeva**
Bakı Slavyan Universiteti
aynurabdullayeva28@gmail.com

## REPRESSİYANIN TƏDRİSİNDƏ YENİ METODOLOJİ MEYİLLƏR

***Açar sözlər:*** *repressiya, ədəbiyyatşünaslıq, monoqrafiya, interaktiv təlim metodları, ideologiya*
***Key words:*** *repression, literary criticism, monograph, interactive teaching methods, ideology*
***Ключевые слова:*** *репрессии, литературная критика, монография, интерактивные методы обучения, идеология*

Repressiya antiinsani, antibəşəri bir prosesdir. İmperiya ideologiyası tabeçiliyində olan millətləri, onların düşünən zəkalarını, böyük şəxsiyyətlərini repressiyaya məruz qoymuşdur və bu millətin genefonduna qarşı yönəldilmiş siyasi qəsddir. Bu mövzuda B.Əhmədovun, N.Qəhrəmanlının, N.Qurbanovanın kitab və məqalələri, "Ədəbi mübahisələr", "Azərbaycan ədəbiyyatşünaslığı", "Əli Nazim" monoqrafiyalarımız çap olunmuşdur. Bu əsərlər ayrı-ayrı şəxsiyyətlərin taleyində insanı yaddaşı unutmağa, manqurta çevrilməyə, psixoloji cəhətdən sındırılmağa məruz qoyan rejimi və onun ideologiyasını tənqid edir.

Bu məqalədə Ə.Cavad, H.Cavid, M.Müşfiq kimi şairlərimizin əsərlərinin müasir interaktiv metodlarla ümumtəhsil məktəblərində tədris olunması yollarından bəhs olunur.

Xalq Cümhuriyyəti və onun liderləri kütləvi şəkildə repressiyalara məruz qalıblar, çünki onlar türk dövlətinin zəngin tarixi ənənələrinə söykənmişdilər və öz qızğın, əvəzsiz fəaliyyətləri ilə bu mirasın artırılmasına xidmət edirdilər. Təsadüfi deyildir ki, onların əksəriyyəti öz əlləri ilə doldurduqları anketlərində milliyətiniz qrafasının qarşısında düşünmədən "türk" yazmışdır. Bolşeviklərin Azərbaycan Xalq Cümhuriyyətini devirməsindən sonra H.Cavid, Ə.Cavad, A.Şaiq kimi şairlərə münasibət dəyişdi və xüsusilə, iki romantik şair, müəllim-tələbə H.Cavid və Ə.Cavad kəskin təqib və təziqlərlə üzləşdilər. Repressiya əslində 1937-ci ildə deyil, bu münasibətlərin düyünləri hələ əvvəllərdə vurulmağa başlamışdır. Azərbaycanın Hüseyn Cavid, Abbas Mirzə Şərifzadə, Mikayıl Müşfiq Yusif Vəzir Çəmənzəminli, Nəriman Nərimanov, Ruhulla Axundov kimi şair və yazıçıları, eləcə də sənət adamları, aktyorları və b. repressiyaya məruz qalmışlar.

Yazdığı şeirlərə görə Ə.Cavadı satqınlıqla, pantürkizmlə suçlayaraq sıxışdırırdılar. Ona qarşı tənqidi və ifşa dolu məqalələr ara vermirdi, məqsədlərini həyata keçirtmək vaxtı 1936-cı ilin əvvəlində çatmışdı. Ə.Cavadla bağlı bəzi çıxışlarda onu ədəbiyyatdan atılmalı şəxs kimi qiymətləndirirdilər. Nəticə isə bu olur ki, şair 1937-ci ilin 4 iyununda həbs edilmiş, oktyabrın 13-də güllələnmişdir. Azərbaycan himninin sözlərinin müəllifi, repressiya qurbanı olan Əhməd Cavad uzun illərdən sonra amalı, idealı, sənəti və şəxsiyyəti ilə öz xalqına qovuşdu. Uzun zaman şairin şeirlərindən ayrı düşən xalqımız bu əsərləri yenidən öyrənməyə və öyrətməyə başladı. Hal-hazırda məktəblərdə Ə.Cavadın əsərlərinin öyrədilməsi geniş vüsət almışdır. Ə.Cavadın "Azərbaycan! Azərbaycan!" şeiri V sinifdə, "Azərbaycan bayrağına" şeiri isə IX sinifdə yeni interaktiv metodlarla şagirdlərə öyrədilir. Bu şeirlərdən "Azərbaycan! Azərbaycan!" əsəri tədris olunarkən Azərbaycan himni ilə motivasiya qurmaq məqsədə uyğundur, çünki himnimizin sözlərinin müəllifini hər bir azərbaycanlı əzbər bilir. Himnimizdən verilmiş bir parça ilə motivasiya qurulur və şagirdlərdən müəllif soruşulur və himni yenidən dinləyərkən keçirdikləri hiss və emosiyaları öyrənilir. Şeir oxunduqdan sonra bir cədvəl qurulur və şagirdlərdən fikirləri soruşulur:

Dağlarının başı qarlı,
Sinəsi yaşıl ormanlı,
Dərələrin şirin barlı,
Azərbaycan! Azərbaycan! [4,44]

| Sual | Cavab |
|---|---|
| Azərbaycan təbiəti haqqında nə bilirdiniz? | |
| Şeiri oxuduqdan sonra yeni nə öyrəndiniz? | |

Ə.Cavadın "Azərbaycan bayrağına" şeiri IX sinifdə öyrədilərkən "Azərbaycan! Azərbaycan!" şeiri ilə qarşılıqlı şəkildə tədris etmək məqsədə uyğundur. Bunun üçün hər iki şeir üçün Venn diaqramı qurulur və şagirdlərdən onların oxşar və fərqli xüsusiyyətlərini göstərmələri söylənilir. Beləliklə, şeirin ideyası şagirdlər üçün daha anlaşıqlı olur. Bu zaman şeirdən bir parçanı digər şeirlə müqayisə etmək deyilə bilər:

Gedərkən Turana çıxdın qarşıma,
Kölgən dövlət quşu, qondu başıma.
İzin ver gözümdə coşan yaşımı,
Dinlətsin dərdini aha, bayrağım! [5,13]

Böyük romantik şair H.Cavid cahan savaşının, hərbin, çaxnaşmaların törətdiyi fəlakətlərdən, bəşəriyyətin sarsıntılarından yanğı ilə söhbət açırdı, bədii əsərlərində ziyalıları onların qarşısını almağa çağırırdı. O, əsərlərində türklərin, türk dünyasının dirçəlişi, birliyi və yüksəlişi məsələsini önə çəkirdi. H.Cavid Cümhuriyyət dönəmində müstəqillik, istiqlal mövzusunda mühüm əsərlər yazmışdır. Hətta M.Ə.Rəsulzadə bildirirdi ki, "Hüseyn Cavid, Məhəmməd Hadi, Abdulla Şaiq və başqaları bir çox yeni əsərlər nəşr edirdilər" [4, 3]. AXC dönəmində H.Cavidin

faydalı işlərindən biri də dərslik yaratmaq istiqamətindəki işləri idi. Onun A.Şaiqlə birlikdə yazdıqları "Ədəbiyyat dərsləri" kitabı bu gündə dəyərini itirməmişdir.

Yazdığı əsərlərə görə mühakimə olunan şair 1937- ci ildə Azərbaycan cinayət məcəlləsinin 72-73-cü maddələri ilə təqsirli bilinir və həbs edilir. H.Cavidin bəraətindən sonra Mehdi Hüseynin Hüseyn Cavidlə bağlı dediyi sözləri xatırlamaq yerinə düşər:

"...Hüseyn Cavid kimi nadir ədəbi simanı mədəniyyət tariximizdən silib atmaq, ən azı ədalətsizlik və bəlkə də cinayət olardı. Biz "Şeyx Sənan", "İblis" və "Səyavuş" əsərlərinin müəllifini heç bir vaxt və heç bir vəchlə düşmənlərimizə verə bilmərik. Hüseyn Cavid Azərbaycan xalqının oğludur. Onun poetik yaradıcılığı Azərbaycan xalqının milli sərvətləri xəzinəsinə daxildir. Bizim borcumuz Hüseyn Cavid irsinin düzgün qiymətini verməkdən ibarətdir. Biz bu irsə ehtiyat və qayğı ilə yanaşmalıyıq"[1, 25].

Sibirin insan ayağı dəyməmiş yerində ölən şairin nəşini gətirmək üçün 1982-ci ildə Azərbaycan Respublikasının Prezidenti (o illərdə Respublikada KP MK-nin birinci katibi idi) Heydər Əliyevin xüsusi göstərişi ilə azərbaycanlı Həmid Cəfərov başda olmaqla bir neçə nəfərdən ibarət nümayəndə heyəti göndərilir. Xalq o illərdə Azərbaycanın bir çox qeyrətli övladları kimi haqsız ittihamlara məruz qalmış oğlunu qarşılamaq üçün təyyarə limanına axışır. Belə bir sənətkarın ədəbi irsini öyrənmək işini məktəb şagirdlərindən başlamaq zərurəti həmişə olmuşdur. VIII sinifdə H.Cavidin "Ana" əsəri və XI sinifdə onun həyat və yaradıcılığını yeni üsullarla öyrədilməsi işi böyük səmərə verir. VIII sinif şagirdlərinə "Ana" əsəri tədris olunarkən bir çox metodlardan istifadə edilə bilər ki, bunlardan biri də "Klaster" üsuludur. Bu üsulla uşaqlardan insanların ən dəyərli varlığı olan ana ilə bağlı fikirləri öyrənildikdən sonra ədibin ananı nə cür dəyərləndirdiyi göz qabağına gəlir.

XI sinifdə H. Cavidin həyat və yaradıcılığı öyrədilərkən isə digər repressiya qurbanları ilə qarşılıqlı əlaqədə öyrədilməsi və digər repressiya qurbanlarının xatırladılması zəruridir və BİBÖ üsulundan istifadə etməklə şagirdlərin keçmiş məlumatları ilə yeni qazandıqları məlumatlar arasında fərqləri görmək mümkündür.

| Bilirəm | İstəyirəm biləm | Öyrəndim |
|---|---|---|
| | | |

Hüseyn Cavidin vaxtilə dediyi "Müşfiq bir oddur ki, öz-özünü yandıracaq" [2,32] ifadəsi kim deyə bilərdi ki, vaxt gələcək həqiqət olacaq. Dahi şair "köhnə kitablar" oxumaqda günahlandırılırdı. O dövrdə M.Müşfiqə qarşı xüsusi bir "maraq" və şairə qarşı amansız hücumlar var idi. Müşfiqin nailiyyətlərinə qısqanclıqla yanaşılmış, onu aradan götürmək üçün çoxdan gözlənilən fürsəti 1938-ci ildə əldə etmişlər. Buna görə də, İsmayılzadə Mikayıl Müşfiq Qədir oğlu Azərbaycan SSRİ cinayət məcəlləsinin 64, 70, 73 maddələri ilə təqsirli bilinir. "Bundan sonra SSRİ Ali Məhkəməsinin Səyyar Hərbi Kollegiyasının 5 yanvar 1938-ci il $11.^{20}$ -dəqiqədə başlanan məhkəməsi $11.^{40}$ dəqiqədə İsmayılzadə Mikayıl Müşfiq Qədir oğlunun güllələnməsi hökmü ilə başa çatır. Hökm yanvar ayının 6-na keçən gecə həyata keçirilir" [1, 42].

M.Müşfiqin ümumtəhsil məktəblərində öyrədilməsinə xüsusi diqqət ayrılır. VII sinif dərsliyində M.Müşfiqin "Yağış yağarkən" və IX sinif dərsliyində "Həyat sevgisi" adlı əsərləri tədris olunarkən müxtəlif interaktiv metodlardan istifadə olunur. "Yağış yağarkən" şeiri təhlil olunarkən müxtəlif üsullardan istifadə olunur.

| Əsərdə diqqətimizi daha çox cəlb edənlər | Bunun səbəbi |
|---|---|
| | |

Şair 1935-ci ildə qələmə aldığı "Həyat sevgisi" şeiri oxucuda sual yaradır: Gənc şair " Gündən-günə gözəlləşən bu işıqlı dünyadan", dostdan, tanışdan nə üçün əl çəkməli idi? Bu təlaşı aşağıdakı bənddə görmək mümkündür:

Ah, mən gündən-günə bu gözəlləşən
İşıqlı dünyadan necə əl çəkim?
Bu yerlə çarpışan, göylə əlləşən
Dostdan, aşinadan necə əl çəkim? [5, 36]

Şagirdlərdən şeirdəki lirik qəhrəmanı səciyyələndirməklə bağlı cədvəli doldurmaları söylənilə bilər.

Azərbaycan poeziyasında intibah, azadlıq və hürriyyət mücahidlərinin əsərlərinin öyrədilməsi işinə müstəqillik dövründə xüsusi qayğı və ehtiram göstərilir. Bu şairlərin əsərlərini yeni interaktiv metodlarla tədris və təhlil edilməsi mühüm məsələlərdən biridir. İstər yuxarıda göstərilən metodlarla olsun, istərsə də digər metodlardan istifadə

| Lirik qəhrəmanın... | | |
|---|---|---|
| İnsanlara münasibəti | Təbiətə münasibəti | Dünyaya münasibəti |
| | | |

edilməsi işin keyfiyyətini yüksəldən faktorlardan biridir.

**Ədəbiyyat:**


1. Aslan K. XX əsrdə repressiyaya məruz qalanlar. Bakı: "Azərnəşr", 2011
2. Mikayıl M. Biblioqrafiya. Azərbaycan Milli Kitabxanası. Bakı 2018

3. Rəsulzadə M.Ə. Çağdaş Azərbaycan ədəbiyyatı. Ankara, 1950
4. Ümumtəhsil məktəblərinin 5-ci sinfi üçün “Ədəbiyyat” fənni üzrə dərslik. Bakı: “Bakınəşr”, 2017
5. Ümumtəhsil məktəblərinin 9-cu sinfi üçün “Ədəbiyyat” fənni üzrə dərslik. Bakı: “Bakınəşr”, 2017

**New methodological trends in repression education**

**Summary**

In the era of independence, Azerbaijani poetry pays special attention to the study of the works of freedom-loving mojaheds. Books and articles by B. Akhmedov, N.Gahramanly, N.Gurbanova, the monographs "Literary disputes", "Azerbaijani literary criticism", "Ali Nazim" are published on this topic. One of the important tasks is the teaching and analysis of the works of these poets with the help of new interactive methods. Using the above methods is one of the factors that improve the quality of work.

**Новые методологические тенденции в репрессивном обучении**

**Резюме**

В эпоху независимости в азербайджанской поэзии изучению произведений свободолюбивых моджахедов уделяется особое внимание. На эту тему публикуются книги и статьи Б.Ахмедова, Н.Гахраманлы, Н.Гурбановой, монографии "Литературные споры", "Азербайджанская литературная критика", "Али Назим". Одной из важных задач является преподавание и анализ произведений этих поэтов с помощью новых интерактивных методов. Использование вышеуказанных методов является одним из факторов, повышающих качество работы.

**G.F.Qəzənfərli**
Bakı Slavyan Universiteti
gulnar.95qezenferli@mail.ru

**ƏDƏBİYYAT DƏRSLƏRİNİN QARŞISINDA DURAN VƏZİFƏLƏR**

***Açar sözlər:*** *ədəbiyyat, tədris, tələb, vəzifə, fəal təlim, ədəbi əsərlər, şagird, ənənəvi üsul*
***Key words:*** *literature, teaching, request, mission, active training, literary works, pupil, traditional method*
***Ключевые слова:*** *литература, обучение, спрос, спальное место, активное обучение, литературные проиэведения, ученик, традиционный метод*

Fəal-interaktiv təlim üsullarının formalaşması təhsil qarsısında yeni tələblər qoyur. Bu tələblərin ödənilməsi baxımından ədəbiyyatın tədrisinin imkanları çoxdur. Çünki ədəbiyyat həyatı təsvir edir. Ədib real, şahidi olduğu, müşahidə etdiyi hadisələri bədii əsərdə qələmə alır. Cəmiyyət və həyatla bağlı elə bir məsələ yoxdur ki, bədii əsərlərdə öz əksini tapmasın. Bu baxımdan bədii nümunələri öyrənməklə şagirdlərdə nitq mədəniyyəti, tələffüz, real düşüncə tərzi və s. formalaşır. Bu deyilənlər əsasında ədəbiyyatın tədrisini aşağıdakı şəkildə qruplaşdırmaq olar:

1. Ədəbi əsərlər
2. Tərcümeyi-hala dair məlumatlar
3. İcmal materialları
4. Ədəbiyyat nəzəriyyəsinə dair materiallar
5. Nitq inkişafı işləri [ 1,125 ]

Ədəbi əsərlərin öyrənilməsinə həsr olunan dərslər də ( ənənəvi ) formasına görə üç yerə ayrılır.

a) əsərin məzmununun öyrənilməsinə həsr olunan dərslər. Proqramda bu dərslərə 2, 3 bəzəndə 4 saat ayrılır.
b) əsərin təhlilinin həyata keçirilməsinə həsr olunan dərslər.
c) əsərin məzmununu və təhlili işlərini birlikdə həyata keçirən dərslər. [1,127]

Əsərin məzmununun öyrənilməsinə həsr olunan dərslərdə vaxt bölgüsü əsərlərin həcminə və anlaşıqlıq səviyyəsinə görə verilir. Əsərin təhlilinin həyata keçirilməsinə həsr olunan dərslərdə isə vaxt bölgüsü əsərin həcmi və hansı sinifdə keçirilməsi nəzərdə tutularaq tədris olunur. Proqram belə dərslərə 1 və yaxud 2 saat vaxt ayırır. Məzmun və təhlil işlərinin birlikdə həyata keçirildiyi dərslərdə isə dərslər kiçikhəcmli olduğu üçün onların tədrisinə bir saat vaxt ayrılır.

Ədəbi əsərlərin öyrədilməsi zamanı kurikulum əsaslı V-XI siniflərdə bu üç iş forması özünü göstərir. Bədii əsərlərin öyrədilməsində ən vacib məqamlar əsərin məzmununun müəyyənləşdirilməsi və təhlil olunmasıdır . Məzmunda əks etdirilən mənəvi-əxlaqi dəyərlər, çatışmazlıqların tənqidi ,müsbət insani keyfiyyətlər və s. məsələlər əsərlərdə öz əsini tapır. Ədəbi əsərlərin məzmunu dərindən öyrənildikdən sonra təhlil dərsləri həyata keçirilməlidir. Fəal-interaktiv təlim metodlarının ədəbiyyat dərslərində tətbiqi dərslərin məqsədlərində, təlim prosesinin gedişində ciddi fərqlər ortaya çıxarır. Bu yeni təlim kursunda şagirdlərə müvafiq bacarıqlar aşılanması nəzərdə tutulur. Bu bacarıqlar əsas standartlarda oz əksini tapır. Dərs prosesində müəllim bədii əsəslərin tədrisi zamanı 1.1. və 1.2. əsas standartlarının tərkibindən mövzunun xarakterinə uyğun gələn alt-standartlar seçir. Məzmun üzərində iş aparılanda 1.1.-dən , təhlil üzərində iş aparılanda 1.2-dən, mövzunun xarakterindən irəli gələn alt-standartlar seçilməlidir. Dərs prosesində müəllim bu tələblərin yerinə yetirilməsi qayğısına qalmalıdır.

Tərcümeyi-hal materiallarının öyrədilməsinə həsr olunan dərslərin də özünəməxsusluqları var. Yeni təhsil proqramında bu materialların öyrədilməsinə dair standart nəzərdə tutulmamışdır. Lakin ənənəvi üsulla tədris olunan dərslərdə bu mövzulara ayrıca saatlar verilmişdir. Bu dərslərdə iki formada özünü göstərirdi.

Birinci forma ədibin həyat və yaradıcılığını birlikdə öyrətməyi nəzərdə tuturdu. Buna isə cəmi bir saat vaxt verirdi.

Ikinci forma isə şair və ya yazıçının həyat və yaradıcılığının ayrılıqda öyrənilməsini nəzərdə tuturdu. Ədəbiyyat tarixi kursunun əhatə olunması baxımından bu X-XI siniflərə aid edilirdi.

Yeni üsulla tədris olunan dərslərdə isə bu cür məlumatlar əsərin öyrənilməsinə başlanarkən əvvəlcə ədibin tərcümeyi-halı haqqında giriş sözü formasında qeyd olunur. Kurikulumda sənətkar haqqında məlumatların öyrədilməsi standartlarda öz əksini tapmamışdır. Standartlarda isə nəzərdə tutulmayan məsələnin şagirdlərə öyrədilməsi vacib hesab edilmir. Görünür ki, tərcümeyi-hal materialları şagirdlərə hansısa bir konkret bacarıqlar aşılamağa imkan vermədiyini düşünənlər bu barədə standartlarda heç nə qeyd etməmişlər. [1, 128]

İcmal materiallarının öyrədilməsinə həsr olunan dərslər özündə ümumi məlumatlar əks etdirir. İcmal sözü cəmləmə, toplama, xülasə mənasını verir. Ənənəvi üsulla tədris olunan dərslərdə bir sıra materiallar bu çərçivəyə uyğun gəldiyindən onlar bu ad altında ümumiləşdirilmişdir. Ədəbiyyat kursuna başlananda ilk mövzu “Giriş” mövzusu adlanırdı.

Bu xarakterli ikinci qrup mövzu isə tarixi-ədəbi icmallardır. Bu mövzular isə X-XI siniflərin dərsliklərində əks olunmuşdur. Proqram isə bu mövzulara , əsasən, bir saat, tarixi-ədəbi icmallara isə iki saat vaxt ayırırdı. Ənənəvi kursdan fərqli olaraq kurikulumda icmal materialları ilə bağlı standartlar qeyd edilməmişdir.

Ədəbiyyat nəzəriyyəsinə dair materialların öyrədilməsiə ənənəvi kursda ayrıca saat ayrılmırdı. Proqram yalnız nəzəriyyə haqqında verilən biliklərin sistemləşdirilməsi və təkrarlanmasına vaxt ayırırdı. Yeni üsullarla həyata keçirilən dərslərdə ədəbiyyat nəzəriyyəsinə ayrıca saatların verilməsi nəzərdə tutulmasa da, kurikulumda növ və janr xüsusiyyətləri, təsvir və ifadə vasitələri ilə bağlı müəyyən standartlar verilmişdir. Dərs prosesində siniflər üzrə bir çox nəzəri məlumatların sadədən mürəkkəbə doğru şagirdlərə aşılanması bir tələb kimi irəli sürülmüşdür.

Nitq inkişafı işlərinin təşkilinə həsr olunan dərslər. Ənənəvi kursda bu dərslərə ya xüsusi saat ayrılmır, ya da inşa yazılarında , onların təshih olunmasında ayrıca saatlar proqramda nəzərdə tutulurdu. Dərs prosesində müəllim şagirdlərin şifahi və yazılı nitqinin inkişafina diqqət yetirməli və onları düzgün istiqamətləndirməlidir. Ədəbiyyat fənn kurikulumunun məzmun xəttində şifahi və yazılı nitq üçün əsas və alt-standartlar müəyyən edilmişdir.

**Ədəbiyyat:**

1. Yusifov F. Ədəbiyyatın tədrisi metodikası, Bakı-2015
2. Hacıyev A. Azərbaycan ədəbiyyatının tədrisi metodikası, Bakı-2003
3. Muradov B. Orta məktəbdə ədəbi əsərlərin öyrədilməsi, Bakı-1992
4. Həsənli B. Ədəbiyyatın tədrisi metodikası, Bakı-2014
5. Hüseyn oğlu İ. Ədəbiyyat dərslərində yeni texnologiyalar: fəal-interaktiv təlim, bakı-2009
6. Əhmədov C. Ədəbiyyatın tədrisi metodikası, Bakı-1992

**The tasks facing literature lessons**

**Summary**

Formation of active learning methods puts new demands on education. There are plenty of opportunities for teaching literature in terms of paying for it. Writes the real events of the writer in his artistic work. Artistic patterns form pupils pronouns. It is necessary to create conditions for the students liberty in active classes.

**Задачи, стоящие перед уроками литературы**

**Резюме**

Формирование активных методов о вучения предъявляет новые требования к обраэованию. На уроках литературы важно обращать внимание на работу с художественным текстом. А также надо уделять внимание биографическщй информации. Ученики должны сами свободно выражать свою точку зрения.

**A.M.Əliyeva**
Bakı Slavyan Universiteti
arzu7ali@gmail.com

# İSMİN HAL KATEQORİYASININ TƏDRISINDƏ INTERAKTIV METODLARDAN ISTIFADƏ

***Açar sözlər:*** *ismin halları, interaktiv metodlar, müasir dərs, fəal təlim.*
***Key words:*** *noun cases, interactive methods, modern lesson, active education*
***Ключевые слова:*** *падежи имен существительных , интерактивные методы, современный урок, активное обучение.*

Azərbaycan dilinin qrammatikasının morfologiya şöbəsinə daxil olan nitq hissələrinin sırası isimlə başlayır. İsmin birinci gəlməsi onun qraammatik mənası, əşyanın adını bildirməsi ilə bağlıdır. Bununla əlaqədar olaraq orta ümumtəhsil məktəblərdə Azərbaycan dili dərslərində morfologiyanın tədrisində isim ilk keçirilən əsas nitq hissəsidir. Şagirdlərin isim haqqında ilkin təsəvvürləri ibtidai siniflərdə formalaşdırılır. Proqram əsasında ismin əşya bildirən nitq hissəsi olması, morfoloji sualları (kim? nə? hara?), ümumi və xüsusiliyi, tək və cəm olması, konkret və mücərrədliyi, quruluşca növləri (sadə, düzəltmə, mürəkkəb), hal kateqoriyası, mənsubiyyət kateqoriyası, xəbərlik şəkilçiləri öyrədilir və VI sinfin sonuna qədər isimlə bağlı bütün biliklər tədris edilmiş olur. Biliklərin öyrədilməsində qarşıya çıxan problemləri, qarışıqlıqları, çətinlikləri müəllim məqsədəuyğun üsul və vasitələrlə həll etməyi bacarmalıdır. Bu baxımdan şagirdlərin fəal idrak fəaliyyətinə əsaslanan və tədris prosesinin digər iştirakçıları ilə əməkdaşlıq şəraitində həyata keçirilən interaktiv təlim metodlarından istifadə əhəmiyyətlidir.

Müəllim təkcə ənənəvi metodlarla bu günün tempi ilə heç cür ayaqlaşa bilməz. Çünki ənənəvi təlim prosesində biliklərin praktiki tətbiqi üçün şagirdə müvafiq imkan yaradılmır. Dərsin məzmunu daha çox nəzəri öyrədilir və həyatın tələblərinə uyğunlaşdırılmır. Şagirdin şəxsi təcrübəsi, onun tələbatları, maraqları, qabiliyyətləri və fərdi xüsusiyyətəri nəzərə alınmır. Ona görə də şagirdlər verilən biliyi lazımı səviyyədə dərk etmir. Şagirdin hazır biliyi mənimsəməsi onun təfəkkürünün inkişafı üçün stimul yaratmır, onun idrak prosesini zəiflədir, uşağı yaradıcılıqdan, sərbəstlik, müstəqillik, təşəbbüskarlıq kimi keyfiyyətlərdən məhrum edir. Nəticədə təlimin səmərililiyi azalır, çünki onun keyfiyyəti şagirdin əqli qabiliyyətlərinin və hafizəsinin inkişaf səviyyəsi, idrak səviyyəsinin olub-olmaması kimi psixoloji amillərdən birbaşa asılıdır.

Fəal (interaktiv) təlim isə şagirdlərin fəal idrak fəaliyyətinə əsaslanan təlimdir. “Çox vaxt bu anlayışın sinonimi kimi “interaktiv təlim metodları” anlayışından istifadə olunur. Bu təlim metodunu ifadə edə bilmək üçün həmçinin “problem-dialoji”, “evristik təlim” anlayışlarından da istifadə olunur”. [4,11]

İnteraktiv təlimin səciyyəvi xüsusiyyətləri aşağıdakılardır:

- Məktəblilərin qruplarla və cütlərlə fəaliyyəti;
- Şagirdin aktivliyinin təmin edilməsi;
- Müəllim-şagird və şagird-şagird əməkdaşlığı;
- Didaktik oyunlar;
- Şagirdlərin özlərini və bir-birlərini qiymətləndirməsi;
- Şagirdlərin diskusiya və debata cəlb edilmələri.

Yuxarıda qeyd edilən səciyyəvi xüsusiyyətlər müəllim tərəfindən diqqətlə təhlil olunmalı və lazımlı məqamlar seçilərək vəhdətdə tədris olunmalıdır.

Müəllim təlim metodlarını seçərkən aşağıdakı şərtləri nəzərində saxlamalıdır:

- Dərs materialının məqsəd, vəzifə və məzmunu;
- Şagirdlərin yaş xüsusiyyətləri, onların dərketmə imkanlarının səviyyəsi;
- Tədris prosesinin texniki təminatı;
- Şagirdlərin savadlılığı və inkişaf dinamikası;
- Müəllimin pedoqoji ustalığı, onun şəxsi keyfiyyətləri;
- Materialın öyrənilməsinə ayrılan vaxt.

İnteraktiv təlim metodlarından istifadə edilməsi nəticəsində şagirdlərin bilik və bacarıqları inkişaf edir, özlərinə inam yaranır, yaradıcı, məntiqi və tənqidi təfəkkürü formalaşır, fərdin və qrupun məsuliyyəti artır.

İsmin hal kateqoriyasının tədrisində interaktiv təlim metodlarının müxtəlif növlərindən istifadə olunur:

Beyin həmləsi (əqli hücum), Söz assosiasiyası, Şaxələndirmə, BİBÖ, İnsert, Venn diaqramı, Kublaşdırma, Debatlar (çarpaz müzakirə), İşgüzar səs-küy, Diskussiya və s. [ 2, 195]

Hal kateqoriyasının tədrisində çətinlik yaradan problemlər biri qeyri-müəyyən yiyəlik və təsirlik halda olan isimlərin şəkilçisiz işlənməsi ilə bağlı olaraq adlıq halla qarışdırılmasıdır. Hal və mənsubiyyət şəkilçilərinin omonimliyi də çaşqınlığa səbəb olur. Belə ki, yiyəlik hal (-ın, -in, -un, -ün) və II şəxs, təsirlik hal (-ı, -i, -u, -ü) və III şəxs təkinin formaca eyni olması şagirdlərin onları bir-birindən ayırd etməsini mürəkkəbləşdirir.

Müəllim ismin təsirlik halını keçərkən Venn diaqramından istifadə edərək şagirdlər tərəfindən adlıq və təsirlik hallar arasındakı oxşar və fərqli cəhətlərin dərk edilməsini təmin edə bilər.



Daha sonra müəllim –ı, -i, -u, -ü şəkilçisinin omonimliyi haqqında məlumar verir və şagirdlərdən birini lövhəyə çağırır. Bu şəkilçinin omonimliyi haqda daha geniş məlumat vermək üçün şaxələndirmə metodundan istifadə etmək olar.




BİBÖ metodu vasitəsilə isə şagirdlərin bildikləri və yeni öyrəndikləri məlumatlar aşkarlanır.

| Bilmək istəyirəm | Bilirəm | Öyrəndim |
|---|---|---|
| -ı$^4$ şəkilçisinin daha hansı xüsusiyyətlər var? | -ı$^4$ şəkilçisinin ismin hal və mənsubiyyət şəkilçisi olduğunu bilirəm. | -ı$^4$ şəkilçisinin leksik şəkilçi olduğunu öyrəndim. |

Kublaşdıma vasitəsilə şagird hallanma mövzusunu təsvir etməyə, müqayisə etməyə, əlaqələndirməyə, təhlilə, tətbiq və mübahisəyə yönəldir.

Debatlardan istifadə zamanı müxtəlif mövqelər toqquşur və dəlillərin müdafiəsi nəticəsində tərəflərdən biri üstünlük qazanır. Debatları həm şifahi, həm də yazılı aparmaq mümkündür.

Diskussiya şagirdlərə artıq məlum olan materialın məzmununu zənginləşdirir,onu qaydaya salmağa, möhkəmləndirməyə kömək edir. Müəllim də şagirdlərin biliklərinin dərinliyi və sistemi, onların təfəkkür xüsusiyyətləri haqqında etibarlı məlumat alır. Diskussiya dəyirmi masa ətrafında keçirilməlidir ki, hamı bir-birini görə bilsin.

Nəticə olaraq qeyd edək ki, tədris prosesində interaktiv metodlardan istifadə biliklərə müstəqil yiyələnmək, bu bilikləri yaradıcılıqla işləmək, biliklərdən həyat məqsədlərinə çatmaq üçün istifadə etmək, öz yoldaşları ilə problemin həllində əməkdaşlıq etmək kimi qabiliyyətlərə malik olan şəxsiyyətin formalaşmasına imkan yaradır.

**Ədəbiyyat:**

1. Balıyev A.H., Balıyev H.B. Azərbaycan dilinin tədrisi metodikası. Bakı: “Qismət”, 2014
2. Kərimov Y. Ş. Təlim metodları. Bakı, 2007.
3. Seyidov Y. Azərbaycan dilinin qrammatikası. Morfologiya. Bakı: “Bakı Universiteti” nəşriyyatı, 2006.
4. Veysova Z. Fəal/interaktiv təlim. Bakı: “UNİCEF”, 2007.

**İnteractive methods of teaching in the case of nouns categories**

**Summary**

The article focuses on how to use interactive learning methods in the category of noun cases. It is shown what interactive methods can be used to teach different situations. The advantage of interactive learning methods that incorporates the conceptual and social activity of creative thinking and independent learning of new knowledge has been emphasized.

**Использование интерактивных методов в обучении категории падежи имен существительных**

**Резюме**

В статье основное внимание уделяется использованию интерактивных методов обучения в категории падежи имен существительных. Показано, какие интерактивные методы могут использоваться для обучения различным ситуациям. Было подчеркнуто преимущество интерактивных методов обучения, которые включают концептуальную и социальную деятельность творческого мышления и независимое изучение новых знаний.

**G.M.Rzayeva**
Bakı Slavyan Universiteti
rva.g@list.ru

# ŞAGİRD NAİLİYYƏTLƏRİNİN QİYMƏTLƏNDİRİLMƏSİ

***Açar sözlər:*** *qiymətləndirmə, obyektivlik, kurikulum, keyfiyyət, əməkdaşlıq, özünüqiymətləndirmə, məqsəd, nailiyyət*
***Key words:*** *assessment, objectiveness, curriculum, quality, co-operation, self evaluating, goal, achievement*
***Ключевые слова:*** *оценивание, объективность, курикулум, качество, сотрудничество, самооценивание, цели, достижения*

Tədrisdə şagird nailiyyətlərinin qiymətləndirilməsi böyük əhəmiyyət kəsb edir. Qiymətləndirmə təlim prosesində aktivliyi yaratmaq, şagirdləri həvəsləndirmək, biliklərin nə dərəcədə mənimsənildiyini göstərməyə şərait yaradır. Bütün bunları həyata keçirmək üçün müəllim daima öz üzərində işləməli, şagirdləri fəal, müstəqil təlimə cəlb etməlidir. Kurikulum üzrə dərslər ənənəvi təlimdən fərqli olaraq şagirdlərin fəallığını daha çox təmin edir. Belə dərslərdə şagirdlərin qiymət kitabçasında müəllim motivasiya edici sözlərdən istifadə edərək şagirdlərin dərsə marağını daha da artırır.

Qiymətləndirmə ədalətli, obyektiv və düzgün olmalıdır. Məktəblilərin obyektiv şəkildə qiymətləndirilməsi onların daima müvəffəqiyyət qazanmalarına köməklik edir. Müəllim verdiyi qiyməti əsaslandırmalıdır, şagird bilməlidir ki, nəyə görə bu qiymətlə qiymətləndirilib. Bəzi hallarda müəllimlər şişirtmə qiymətlərdən istifadə edərək guya şagirdi həvəsləndirir, lakin bu halda müəllim nəinki özünü hətta şagirdin də yanlış istiqamətlənməsinə səbəb olur. Bəzən də dərslərdə müəllimin şagirdin müəyyən davranışına görə qiymətini kəsməsinin şahidi oluruq. İntizamsızlığına və dəcəlliyinə görə başqa cəza formalarından da istifadə etmək olar. (tənbeh, məktəbli kitabçasında qeyd və s.). Qiymətdən cəza vasitəsi kimi istifadə etmək qətiyyən düzgün deyil.

Şagirdin biliyi qiymətləndirilərkən məzmunla yanaşı forma da nəzərə alınmalıdır. Müəllim şagirdin nə dediyinə fikir verdikdə, onun nitqinə, çıxış etmə qabiliyyətinə də münasibət bildirməli, fikrini söyləməlidir. [3, s. 77]

Məktəbdaxili qiymətləndirmənin 3 növü müəyyən edilmişdir:
-Diaqnostik qiymətləndirmə (şagirdlərin ilkin səviyyəsinin qiymətləndirilməsi)
-Formativ qiymətləndirmə (irəliləmə və geriləmələrin izlənməsi)
-Summativ qiymətləndirmə (yekun qiymətləndirmə)

Diaqnostik qiymətləndirmə şagirdlərin bacarıqlarını, səriştəsini ilkin səviyyədə müəyyənləşdirməkdir. Bu, dərs ilinin əvvəlində və ya şagird başqa hər hansı məktəbdən gəldikdə, sinfini dəyişdikdə və digər bir sıra hallarda həyata keçirilir.[2] Diaqnostik qiymətləndirmə zamanı suallar elə şəkildə hazırlanmalıdır ki, bu suallar şagirdin hansı səviyyədə biliklərə malik olduğunu göstərsin. Qiymətləndirmənin bu forması müəllimə, sinfin ümumi səviyyəsini müəyyən etməyə, gələcək dərslərdə qarşıya çıxa biləcək çətinlikləri aradan qaldıra bilməyə imkan yaradır. Müəllim dərsdə və dərsdənkənar vaxtlarda şagirdin davranışını müəyyən etməli, valideynlərlə həmçinin digər fənn müəllimləri ilə əlaqədə olmalıdır. Belə ki diaqnostik qiymətləndirmə şagirdin psixoloji vəziyyətini, maraq dairəsini, şagirdə fərdi yanaşmağı tələb edir.

Formativ qiymətləndirmə dərs ili müddətində bir qayda olaraq şagirdin fəaliyyətini ardıcıl izləyib təhlil etməkdir. Formativ qiymətləndirmə "qeyri- formal" (çox vaxt qiymətsiz) qiymətləndirmədir. Qiymətləndirmənin bu növü təlim prosesini tənzimləməyə, şagirdlərin dərsə marağını artırmağa xidmət edir, qiymət müəllimin şəxsi kitabçasında və şagirdin məktəbli kitabçasında sözlərlə qeyd edilir. Bəzən müəllimlər yanlışlıqla formativ qiymətləndirmə zamanı rəqəmlərdən istifadə edirlər. Bu düzgün deyil. Formativ qiymətləndirmə müəyyən meyarlar əsasında aparılır. Meyarlar qiymətləndirmənin şəffaf və düzgün aparılmasını təmin edir. Məqsəd qiymətləndirmə meyarında öz əksini tapmalı, dərsin sonunda qiymətləndirilməlidir. Şagirdlər meyarlarla yaxından tanış olmalı və nəyə görə bu qiyməti aldıqlarını dərk etməlidirlər.

| Meyarlar | Qruplar | | | |
|---|---|---|---|---|
| | I qrup | II qrup | III qrup | IV qrup |
| Təqdimat | | | | |
| Vaxta qənaət | | | | |
| Əməkdaşlıq | | | | |
| Ümumi nəticə | | | | |

Formativ qiymətləndirmə zamanı şagirdin özünü qimətləndirməsi də mümkündür. Bəzən müəllim bilərəkdən şərait yaradır ki, məktəblilər özlərinə qiymət yazsınlar. Bunun üçün özünüqiymətləndirmə forması tətbiq

olunur və sonda şagirdə qiymətləndirmə cədvəlini müstəqil doldurmaq tapşırılır.Bu zaman şagirdə mütləq başa salınmalıdır ki, özündən deyil, cədvəldəki meyarlara uyğun qiymətləndirmə aparsın. Özünüqiymətləndirmə vərdişlərini yaratmaq üçün bütün sinif və müəllimin iştirakı ilə qiymətin şagirdin özü tərəfindən verilməsini və eləcə də şagirdlərin bir-birinin işinə qiymət verməsini tətbiq etmək lazımdır. Şagirdin özünü qiymətləndirməsi müəllimin qiymətləndirilməsindən əvvəl tətbiq edilməlidir, daha sonra isə bu qiymətlər əlaqələndirilməli və müzakirə edilməlidir.

Qiymətləndirmə zamanı testlərdən geniş şəkildə istifadə etmək olmaz. Suallar daha çox şagirdi düşündürməli, onu yaradıcılığa sövq etməlidir. Ümumiyyətlə, formativ qiymətləndirmədə testlərin sayı nə qədər az olsa, o qədər yaxşıdır. Testlərin əvəzinə şifahi sorğu, yazı işləri, layihə istifadə edilməlidir. Tədris prosesində əyanilik, əyani vəsaitlərdən düzgün istifadə fənlərin təlim keyfiyyətini yüksəldir. Test tapşırıqlarından yalnız summativ qiymətləndirmədə istifadə etmək məqsədə uyğundur.

Summativ (yekun) qiymətləndirmə müəyyən mərhələdə, bölmə və yarımilin sonunda şagird nailiyyətlərinin səviyyəsini yoxlamaq məqsədilə aparılır. Nailiyyətləri yoxlamaq üçün müəllim tapşırıq və testlərdən istifadə edir, həmçinin əlavə mənbələrə də müraciət edir. Summativ qiymətləndirmə kiçik summativ, böyük summativ, yekun summativ qiymətləndirmədən ibarətdir.

Kiçik summativ qiymətləndirmənin sual və tapşırıqları fənni keçən müəllim tərəfindən, böyük summativ qiymətləndirmə isə məktəb rəhbərliyinin təşkil etdiyi komissiya tərəfindən həyata keçirilir. Yekun qiymətləndirmə vasitəsilə isə son nəticə alınır və şagirdlərin öyrənmə bacarığının hansı səviyyədə olduğu müəyyənləşir.

“Robert Steyk formativ və summativ qiymətləndirməni şorba qiymətləndirməsi ilə müqayisə edərək belə bir nəticəyə gəlmişdir ki, aşpaz şorbanın dadına baxanda bu, formativ qiymətləndirmədir, nə vaxt ki, nahar edib şorbanı yeyir, bu isə summativ qiymətləndirmədir. Başqa sözlə, formativ qiymətləndirmə keyfiyyətin daxili nəzarətini əks etdirir, summativ qiymətləndirmə isə son nəticənin nə dərəcədə yaxşı işlənməsini göstərir” [4, s. 248].

Məktəblilərin təlim nailiyyətlərinin izlənilməsi cox geniş və əhatəli prosesdir. Müasir dövrdə təhsilin keyfiyyətinin yüksəldilməsində qiymətləndirmə mühüm pedaqoji vasitədir. Qiymətləndirmə keyfiyyəti idarə edən əsas amildir. Qiymətləndirmə həm təlim, həm də tərbiyəvi əhəmiyyət daşıyır. Təlim baxımından bilik, bacarıq və vərdişlərin səviyyəsinə qiymətin verilməsində özünü göstərirsə, tərbiyəvi cəhətdən məktəblilərin fəallığına, çalışqanlığına intizamlı olmasına görə pedaqoji ədəbiyyatda özünü göstərir[1, s. 225] .Qiymətləndirmədən nə qədər düzgün isifadə edilsə, dərsdə o qədər çox səmərə əldə etmək mümkündür. Buna görə də müəllim daima öz üzərində işləməli, şagirdlərlə əməkdaşlıq etməlidir. Şagirdlərlə iş zamanı onların müstəqil fikir söyləməsinə, düşünmələrinə, mühakimə sürməyinə, yaradıcılıq bacarıqlarını inkişaf etdirilməsi üçün müxtəlif üsul və vasitələrdən istifadə etmək lazımdır. Bu zaman şagirdin dərsə marağı artır və o, sırf qiymət almaq xatirinə deyil, dərsə həvəs göstədiyi üçün çalışır.

**Ədəbiyyat:**


1. Abbasov A. Pedaqogika: orta ixtisas məktəbləri üçün dərslik. Bakı: Mütərcim, 2010, 348 səh.
2. Azərbaycan Respublikasının ümumi təhsil sistemində Qiymətləndirmə Konsepsiyası. Bakı. 2009.
3. Cavadov. İ Ümumtəhsil məktəblərində monitorinq və qiymətləndirmə üzrə işin sistemi. Bakı: 2006, 150 səh.
4. Əhmədov H, Zeynalova N. Pedaqogika. Bakı: Elm və təhsil, 2016, 455 səh.


**Evaluation of student achievement**

**Summary**

Assessment of student achievement sets goals for improving learning, evaluating progress towards achieving them. Assessment is the process of collecting information about the ability of the student to master knowledge, use them, and draw conclusions. The assessment does not fully reflect the knowledge gained, but it is a reliable and adequate indication of the degree of acquisition.

**Оценка успеваемости учащихся**

**Резюме**

Оценка успеваемости учащихся ставит цели для улучшения обучения, оценки прогресса в их достижении. Оценка - это процесс сбора информации о способности ученика овладевать знаниями, использовать их и делать выводы. Оценка не полностью отражает полученные знания, но является надежным и адекватным показателем степени приобретения.

**П.Р.Салимханова**
Азербайджанский университет языков

# ОБУЧЕНИЕ ИНОСТРАННЫМ ЯЗЫКАМ НА ОСНОВЕ ИСПОЛЬЗОВАНИЯ МУЛЬТИМЕДИЙНЫХ ПРОГРАММ

***Ключевые слова:*** *информационные технологии, когнитивный процесс, интернет-ресурсы, аудирование, интерактивная доска, электронные ресурсы.*

***Açar sözlər****: informasiya texnologiyaları, idrak prosesi, internet resursları, dinləmə, interaktiv lövhə, elektron resurslar.*

***Key words:*** *information technologies, cognitive process, Internet resources, audition, interactive board, electronic resources.*

В настоящее время идет активный процесс информатизации в области образования, который предполагает интенсивное внедрение и применение новых информационных технологий, использование всех средств коммуникаций, способствующих формированию интеллектуально развитой творческой личности, хорошо ориентирующейся в информационном пространстве, готовой к саморазвитию и применению этих знаний в будущей профессиональной деятельности.

Это способствует активизации познавательной деятельности студентов, стимулирует и развивает когнитивные процессы: мышление, восприятие, память.

Термин “мультимедиа” означает: много сред. Такими информационными средами являются: текст, звук, видео. Программные продукты, использующие все эти формы представления информации, называются мультимедийными. Использование мультимедийных средств обучения – закономерный этап развития педагогических технологий.

Неограниченные возможности при изучении иностранного языка дает Интернет, поскольку размеры Интернет-ресурсов безграничны. Глобальная сеть предоставляет неограниченное количество учебного материала, включая любую значимую информацию, страноведческий материал, газетные и журнальные статьи, учебную литературу и т.п. [1, с.12].

Решается целый ряд образовательных задач при изучении иностранного языка на основе материалов, выложенных в сети Интернет: формирование умений и навыков аудирования, чтения, письменной речи, повышение словарного запаса, а также формирование у обучающихся устойчивой мотивации к изучению языка.

Появилось немало ресурсов и сайтов, направленных на расширение словарного запаса обучающихся, повторение и закрепление грамматических правил, предназначенных для просмотра видео на иностранном языке с упражнениями для развития навыков аудирования и др.

В высших учебных заведениях появились интерактивные доски, планшеты. Преподаватели разрабатывают планы уроков, опираясь на новые технологии. "Мультимедиа программы делают процесс обучения иностранным языкам более эффективным, потому что при их использовании стимулируется сразу несколько каналов восприятия, воздействуя на различные виды памяти: зрительную, слуховую, эмоциональную, моторную." [2, с. 109] Новый материал удобно представить в виде презентации или видеоролика. Упражнения студенты могут выполнять на интерактивной доске или за компьютером в классе с помощью сети интернет.

Применение информационных технологий позволяет экономить время на уроке и перенести часть заданий, требующих больших временных затрат, на дом.

Сегодня Интернет размыл информационные границы между государствами, и аудио на иностранном языке стало доступным, а современные компьютерные технологии внесли в аудирование по английскому языку долгожданные новшества. Таким образом, во многих программах, размещенных в Интернете, стала доступной пофразовая синхронизация текста и звука с возможностью проигрывать любую часть текста на выбор. Аудирование по иностранному языку наконец-то начало становиться комфортным и доступным.

В идеале, чтобы слушать иностранный язык онлайн с наибольшей пользой и наименьшей потерей времени, аудио на иностранном языке должно иметь как транскрипт, так и перевод на русский язык.

К более эффективному использованию изучению иностранного языка приводит предоставление следующих возможностей аудирования. Во-первых, для более удобного прослушивания английского аудио необходима синхронизация аудио с текстом и переводом. Во-вторых, помимо самого текста на иностранном языке, следует озвучить каждое отдельное слово в тексте. В-третьих, желательно делать перевод не только текста, но и каждого слова в тексте.

Технические преимущества обучения английскому языку при помощи компьютера: возможность осуществлять технический перевод; использовать программы проверки грамматики и орфографии; использование мультимедиа, интерактивного видео при обучении устной речи. Графические возможности компьютера выделяют этот метод обучения на фоне традиционных и позволяют реализовать принцип наглядности обучения. Образовательное значение компьютерных сетей, как локальных, соединяющих

несколько машин в одном учебном заведении, так и глобальных, объединяющих миллионы пользователей по всему миру, практически неоценимо.

Не меньшее влияние при изучении иностранного языка Интернет оказывает на формирование у студентов устойчивой мотивации к изучению языка.

В соответствии с классификацией Е.И. Пассова, различают внешнюю и внутреннюю мотивацию при изучении иностранного языка [3, с. 8].

К внешней мотивации относятся так называемая широкая социальная мотивация, а также личностная мотивация, связанная с перспективой развития личности. Как показывает исследование мотивации изучения иностранного языка в учреждении высшего профессионального образования Т.С.Петровской и И.Е. Рымановой [4, с. 32], 34% респондентов указали на потенциальную возможность в будущем общаться по профессиональным вопросам с иностранными коллегами посредством Интернета. Этот фактор относится к мотивации, связанной с перспективой развития личности, а именно, к формированию и развитию профессиональных компетенций.

Однако, на мой взгляд, больший интерес вызывает внутренняя мотивация, к которой относятся коммуникативная мотивация, а также мотивация, порождаемая собственно учебной деятельностью (операционно-инструментальная мотивация) [1, с. 22].

Результаты того же исследования Т.С.Петровской и И.Е. Рымановой [4,с.22] показали, что в рамках коммуникативной мотивации решающую роль играет общение с использованием современных информационных технологий (чатов, форумов, электронной почты и т.д.). На эту составляющую коммуникативной мотивации при изучении иностранного языка указали 55% респондентов. В аспекте операционно-инструментальной мотивации 58% опрошенных изучают иностранный язык для того, чтобы иметь возможность ознакомиться в Интернете на языке оригинала с научными текстами и статьями по своей специальности, представленными в большем количестве на иностранном языке.

В связи с этим, исследованием установлено, что студенты часто останавливают свой выбор на элективных курсах, а именно, курсах профессионального иностранного языка. К тому же, наличие в образовательном учреждении зон WiFi также создает благоприятные и привлекательные условия для изучения английского языка.

Как отмечает Свиридон Р. А. "задания (с применением информационных технологий) способствуют приобретению культурологических знаний, формированию элементов глобального мышления и устойчивой мотивации познавательной деятельности", они "не только способствуют формированию и развитию определённых навыков и умений в области иностранного языка, но и формируют культуру общения обучаемых, как на родном, так и на иностранном языках в целом." [5, с. 109]

Согласно исследованиям [6, с.16], использование смешанного обучения (blended learning) является эффективным при изучении иностранного языка на старших курсах, так как оно приводит к оптимизации учебного процесса при занятости студентов выполнением проектов и изучением дисциплин по прямой специальности, дает возможность эффективной организации их самостоятельной работы с помощью информационных технологий и электронно-коммуникационных учебных оболочек.

Помимо развития языковых компетенций, оно привело к повышению мотивации изучения языка, степени самостоятельности студентов. Таким образом, использование информационно-коммуникативных технологий и сети Интернет педагогически целесообразно, приводит к оптимизации процесса образования.

Практика показывает, что применение информационных технологий на занятиях способствует росту заинтересованности и мотивации студентов, развивает их творческие способности, ведет к поиску нестандартных решений. Многие студенты отметили, что благодаря виртуальному взаимодействию улучшились не только иноязычные навыки и умения, но также повысилась компьютерная грамотность, они узнали о многих интересных сайтах и инструментах, например, таких как: Quizlet.com, Prezi.com, Power Point, Youtube, эти и многие другие сайты позволяют студентам создавать нестатичные презентации, которые можно сопровождать видео и записью аудио, а также заучивать слова на любом иностранном языке с помощью создания собственных словарных карточек, из которых на сайте генерируются упражнения, игры и тесты.

Применение информационных технологий, безусловно, позволяет повысить эффективность занятий, перенести часть работы во внеурочное время, оперативно реагировать на вопросы студентов и решать возникающие проблемы. "Использование компьютерных технологий приближает обучение к реальной жизни, помогает использовать увлечение студентов компьютерной деятельностью в повышении их интереса к изучению иностранных языков. Мультимедиа технологии представляют собой несомненную новизну и позволяют внести положительные изменения в традиционный процесс обучения иностранным языкам." [1, с. 109] Но информационные технологии не могут заменить весь процесс обучения, это только дополнительный инструмент, используемый не вместо, а вместе с традиционными методами.

**Литературы:**

1 Peachey N. Web 2.0 Tools for teachers,2012

2Белокопытова М. Ю. Роль ИКТ в обучнии иностранным языкам на неязыковых факультетах // Современная наука: актуальные проблемы и пути их решения. 2013. №3. С. 109-112.

3 Пассов Е.И. Коммуникативный метод обучения иноязычному говорению. Серия: Библиотека учителя иностранного языка. - М.: Просвещение; Издание 2-е, 1991.

4 Петровская Т.С., Рыманова И.Е. Мотивация изучения английского языка студентами технического вуза при смешанном обучении Филологические науки. Вопросы теории и практики Тамбов: Грамота, 2014. № 7 (37): в 2-х ч. Ч. I. C. 152-154. URL: www.gramota.net/materials/2/2014/7-1/43.html

5 Свиридон Р.А. Интенсификация обучения иностранным языкам с использованием ИКТ // Современные тенденции в преподавании иностранных языков в неязыковом вузе. 2014. №8. С. 106-112.

6 Blended Learning in English Language Teaching: Course Design and Implementation / ed. by B. Tomlinson, C. Whittaker. London: British Council, 2013. 252 p. URL: http://englishagenda.britishcouncil.org/sites/ec/files/D057_Blended%20learning_FINAL_WEB%20ONLY_v2.pdf

**Multimediya proqramları əsasında xarici dillərin tədrisi**

**Xülasə**

Məqalədə xarici dillərin öyrənilməsində İKT vasitələrinin effektivliyi, eyni zamanda bu yeniliklərin gələcəkdə gənc mütəxəsislərin yetişməsinə müsbət təsiri tədqiq olunur. Komputer texnologiyaları demək olar ki, bütün fənlərin tədrisində istifadə olunur. Onlar yeni informasiya mənbələrinə yol açır, sərbəst işləri daha səmərəli edir, yaradıcılıq üçün, prefesional vərdiş və bacarıqların toplanması və möhkəmləndirilməsi üçün yeni imkanlar verir, ümumiyyətlə tədrisin yeni forma və metdolarını tədbiq etmək imkanı yaradırlar.

Xarici dil müəllimlərinin, ələxsus ingilis dili müəllimlərinin bu texnoloji imkanları yüksək qiymətləndirməsi daha məqsədə uyğun hesab olunur. Çünki, bu, sadəcə müasir texniki vasitələr demək deyil, tədrisin yeni forma və metodikasıdır, tədris prosesinə yeni yanaşma deməkdir. Tədrisdə multimedia vasitələrinin istifadəsi tələbəyə fərdi yanaşmanı, tələbələrin xüsusiyyətlərini və meyllərini nəzərə alaraq tədrisin fərdiləşməsini və fərqlənməsini təmin edir. Komputer proqramlarından istifadə edərək xarici dilləri öyrənmək tələbələr arasında böyük maraq doğurur.

**The use of multimedia programs in foreign language teaching (FLT)**

**Summary**

This article considers a question of efficiency of implementation of Multimedia and Computer Assisted programs in learning of foreign languages and also about what positive impact these innovations have on process of formation of the future young specialists.

Computer technologies are used in training in almost all areas, open access to new sources of information, increase efficiency of independent work, give new opportunities for creativity, finding and fixing of professional skills, allow realizing essentially new forms and methods of training. Quite naturally, as teachers of foreign languages, especially English appreciated their potential.

Because, it is not only modern technical means, but also new forms and methods of teaching, new approach to training process. Use of multimedia tutorials helps to realize the personal focused approach in training, provides individualization and differentiation of training taking into account features of children, their level of proficiency, tendencies. The learning of foreign languages by means of computer programs attracted huge interest of students.

